QƏZET 01.02.1958-ci İLDƏN ÇIXIR

# GƏNC MÜƏLLİM

BEŞİKDƏN QƏBİR EVİNƏDƏK ÖYRƏNİN!
Məhəmməd Peyğəmbər (S.)

Mart 2015 03 (1067)

AZƏRBAYCAN DÖVLƏT PEDAQOJİ UNİVERSİTETİNİN QƏZETİ

## Rəşid Behbudovun 100 illik yubileyinin keçirilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı



2015-ci ilin dekabr ayında dünya şöhrətli musiqi xadimi, görkəmli müğənni və tanınmış ictimai xadim, SSRİ və Azərbaycan Respublikasının xalq artisti, SSRİ və Azərbaycan Respublikasının Dövlət mükafatları laureatı, Sosialist Əməyi Qəhrəmanı Rəşid Məcid oğlu Behbudovun anadan olmasının 100 illiyi tamam olur.

Rəşid Behbudov Azərbaycanın çoxəsrlik mədəniyyəti tarixinin yetirdiyi böyük simalardandır. Özünəməxsus ifaçılıq tərzinə və həzin lirizm çalarlı ecazkar səsə malik sənətkar təkrarolunmaz yaradıcılığı boyunca sənət aləminə gətirdiyi yeniliklərlə milli musiqi salnaməsini xeyli zənginləşdirmişdir. Çoxşaxəli fəaliyyəti dövründə özünün qurduğu və bu gün də adını daşıyan Azərbaycan Dövlət Mahnı Teatrı mədəniyyətə sanballı töhfə təşkil edir. Rəşid Behbudovun kino aktyoru kimi canlandırdığı unudulmaz obrazlar ölkə kinematoqrafiyasının parlaq səhifələridir. Vətənə və xalqa son dərəcə bağlı olan sənətkar dünyanın ən məşhur teatr səhnələri və konsert salonlarındakı rəngarəng repertuarlı saysız çıxışları ilə Azərbaycan mədəniyyətinə geniş şöhrət qazandırmışdır.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, Azərbaycan mədəniyyətinin inkişafı və təbliği naminə misilsiz xidmətlər göstərmiş qüdrətli sənətkar Rəşid Behbudovun 100 illik yubileyinin layiqincə keçirilməsini təmin etmək məqsədi ilə **qərara alıram:**

1. Azərbaycan Respublikasının Mədəniyyət və Turizm Nazirliyi görkəmli musiqi xadimi Rəşid Behbudovun 100 illik yubileyinə həsr olunmuş tədbirlər planını hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham ƏLİYEV,**
**Azərbaycan Respublikasının Prezidenti**
*Bakı şəhəri, 18 mart 2015-ci il*

# Novruz-xalqımızın əziz milli bayramı

## *ADPU-da Novruz bayramı münasibətilə konsert keçirilib*

Novruz bayramı Azərbaycan xalqının zəngin ictimai-siyasi fikir tarixində, yüksək milli-mənəvi dəyərləri arasında, eyni zamanda çoxəsrlik dövlətçilik tarixində mühüm yer tutur. Xalqımızın ən gözəl milli bayramı olan Novruz bayramı haqqında “Kitabi-Dədə Qorqud” dastanında, Nizaminin “Siyasətnamə”sində, Xətainin “Bahariyyə”sində, Xəyyamın “Novruznamə”sində müxtəlif məlumatlara rast gəlirik. Novruz-yeni gün, yeni ruzi deməkdir.




Qeyd edək ki, Novruz bayramı Günəşin hərəkətinə əsaslanır və dəqiqliyi ilə ilahi məzmun daşıyır. Novruz ən qədim təqvimlərdən biridir. Bu bayramla bizə məlum olan ən qədim təqvim miladdan öncə 505-ci ildə bərpa edilmiş Yeni Avesta təqvimidir. Buna həm də Zərdüşt salnaməsi deyirlər.

Qeyd etdiyimiz kimi, Novruz bayramı xalqımızın dövlətçilik tarixində mühüm əhəmiyyət kəsb edir. 1918-1920-ci illərdə mövcud olmuş Azərbaycan Xalq Cümhuriyyəti Novruzu ilk dəfə olaraq milli bayram kimi rəsmiləşdirmişdi. Lakin Azərbaycanda Sovet hakimiyyətinin qurulması ilə milli bayramların, o cümlədən Novruz bayramının keçirilməsi qadağan olunmuşdu.

Azərbaycan XX əsrin sonlarında ikinci dəfə öz dövlət müstəqilliyini bərpa etdikdən sonra xalqımızın bir çox adət-ənənələri, bayramları, o cümlədən Novruz bayramı yenidən bərpa edildi. Ulu öndər Heydər Əliyev xalqımızın çox böyük istəyi və təkidli tələbi ilə respublikamızda yenidən hakimiyyətə qayıtdıqdan sonra bu bayramın dövlət səviyyəsində keçirilməsinin əsası qoyulmuşdur. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev bir çox bayramlar kimi Novruz bayramının da yüksək səviyədə keçirilməsi üçün lazımi qayğı və diqqət göstərir,xalqımıza təbrik ünvanlayır. Xalqımız hər il Novruz bayramını təntənəli şəkildə qeyd edir.

Novruz bayramı yalnız Azərbaycanda deyil, eləcə də dünyanın bir çox ölkələrində yaşayan 50 milyondan çox soydaşımız üçün milli birliyimizin həqiqi rəmzinə çevrilmişdir. Elə bu səbəbdən də onlar Bahar bayramını böyük ruh yüksəkliyi ilə qeyd edirlər. Həm Şərq dövlətlərinin, həm də Türk dünyasının böyük bayramı olan Novruz Azərbaycanla yanaşı, Türkiyədə, İranda, Türkmənistanda, Özbəkistanda, Tacikistanda, Əfqanıstanda və dünyanın bir çox ölkələrində qeyd edilir.

Mart ayının 16-da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük zalında muğam ustalarının iştirakı ilə Novruz bayramına həsr edilən konsert proqramı keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi iştirak edib. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov universitetin kollektivini bayram münasibətilə təbrik edib, hamıya möhkəm can-sağlığı, uzun ömür, bol ruzi-bərəkət, işlərində uğurlar arzulayıb. Rektor Y.Məmmədov eyni zamanda tanınmış muğam ustası, Azərbaycan Dövlət Mədəniyyət və İncəsənət Universitetinin professoru, “Şöhrət” və “Şərəf” ordenli, Prezident təqaüdçüsü, Xalq artisti Canəli Əkbərova və onun tələbələrinə, həmçinin konsertin təşkilatçılarına öz təşəkkürünü bildirib.



Rektor Y.Məmmədov öz çıxışında vurğulayıb ki, Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, YAP-ın Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın təşəbbüsü, səyləri və bu istiqamətdə apardğı səmərəli əməli fəaliyyəti nəticəsində Novruz bayramı 2010-cu ildən başlayaraq dünya səviyyəsində qeyd edilən bir təqvimə çevrilmişdir. Bununla yanaşı, xalqımızın ən qədim və məşhur sənət növlərindən biri olan xalçaçılıq sənəti Mehriban xanım Əliyevanın vətənpərvər fəaliyyəti sayəsində UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edilmişdir. Bunlardan sonra xalqımızın qədim musiqi aləti olan tar UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edildi, bu yaxınlarda isə milli rəqslərimiz və çövkən oyunu da bu siyahıya daxil edildi. Mehriban xanım Əliyeva həm də muğam sənətinin daha da inkişaf etməsində və dünyada yüksək səviyədə təbliğ edilməsində əvəzsiz xidmətlər göstərmişdir.




Rektor Y.Məmmədov çıxışına davam edərək bildirib ki, hər bir xalqı, milləti digər xalqlardan, millətlərdən dili, adət-ənənələri, milli-mənəvi dəyərləri fərqləndirir. Muğam sənəti xalqımızın ən böyük, ən yüksək milli-mənəvi dəyərlərindən biridir. Muğamlarımız xalqımızın mənəvi cəhətdən zənginləşməsində böyük rol oynayır. Tələbə-gənclərimiz muğamı dərindən sevməlidirlər.



Xalq artisti C.Əkbərov isə öz çıxışında bildirib ki, muğam sənəti bizim milli varlığımızın, milli mənsubiyyətimizin ən mühüm mənəvi göstəricilərindən biridir. Muğam bizim daxili mənəvi dünyamızı dolğun ifadə edir. Muğam həm milli, həm də bəşəri bir sənətdir. Xalqımızın muğam sənəti sahəsində korifey sənətkarları çox olub. Onların arasında Xan Şuşinski, Seyid Şuşinski, Rəşid Behbudov, Zeynəb Xanlarova, Rübabə Muradova, Mahrux Muradova, Qulu Əsgərov, Səxavət Məmmədov, Qədir Rüstəmov, Arif Babayev və digər böyük sənətkarlar xüsusi şərəfli yer tuturlar. Bakıda Muğam Mərkəzinin açılması,muğam müsabiqələrinin keçirilməsi bu sənətə dövlət səviyyəsində göstərilən qayğı və diqqətin əyani təcəssümüdür.

Xalq artisti C.Əkbərov eyni zamanda ADPU-nun rektoru,professor Yusif Məmmədovu xalqımızın görkəmli alimi,böyük ziyalısı kimi səciyyələndirib, ona elmi-pedaqoji və idarəetmə fəaliyyətində uğurlar arzulayıb.

Konsert proqramında xalq mahnıları əsasında təqdim edilən musiqi çələngi ADPU-nun kollektivində yüksək əhvali-ruhiyyə və xoş duyğular yaradıb.

**Mənsur İBRAHİMLİ,**
**Gülnar SÜLEYMANOVA**

# “Azərbaycan təhsilinin aktual problemləri - təbiət, fundamental, humanitar və pedaqoji fənlərin tədrisində yeni istiqamətlər”

## *ADPU-da bu mövzuda respublika elmi-praktik konfransı keçirilib*

Mart ayının 17-də Azərbaycan Dövlət Pedaqoji Universiteti (ADPU) Təhsil Nazirliyinin Təhsil Problemləri İnstitutu ilə birlikdə ümummilli liderimiz Heydər Əliyevin anadan olmasının 92-ci ildönümünə həsr olunmuş “Azərbaycan təhsilinin aktual problemləri - təbiət, fundamental, humanitar və pedaqoji fənlərin tədrisində yeni istiqamətlər” mövzusunda respublika elmi-praktik konfransı keçirib.

Konfrans iştirakçıları əvvəlcə ulu öndər Heydər Əliyevin ADPU-dakı abidəsini ziyarət edib, sonra fakültələr üzrə professor-müəllim heyətinin elmi əsərlərindən, dərslik və dərs vəsaitlərindən ibarət sərgi nümayiş etdirilib, daha sonra isə konfrans “Heydər Əliyev məktəbinin lektoriyası”nda öz işinə başlayıb. İlk olaraq ulu öndər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükutla yad edilib.

ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov konfransı giriş sözü ilə açaraq bildirib ki, “Təhsil millətin gələcəyidir!” deyən ulu öndərimiz Heydər Əliyevin müdrik siyasi kursunun layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev ölkəmizin zəngin iqtisadi potensialının intellekt kapitalına çevrilməsini vacib bir vəzifə kimi qarşıya qoyub. Son illər ölkəmizdə bu istiqamətdə uğurlu nəticələr əldə edilib. BMT-nin insan inkişafı indeksi ilə bağlı son hesabatlarına görə, Azərbaycan 169 ölkə arasında 101-ci yerdən 67-ci yerə keçib. Bizim bugünkü konfrans təhsilin keyfiyyətinin yüksəldilməsi və təhsildə keyfiyyətin idarə olunması baxımından mühüm əhəmiyyət kəsb edir. Rektor Y.Məmmədov cəmiyyətdə, xüsusilə də, media sahəsində təhsilə münasibətin yüksəldilməsinin vacibliyini vurğulayıb və konfransın işinə uğurlar arzulayıb.



Təhsil Problemləri İnstitutunun direktoru, hüquq üzrə fəlsəfə doktoru Qulu Novruzov çıxış edərək konfransın həyata keçirilən təhsil islahatlarına səmərəli təsir edəcəyini bildirib. Q.Novruzov eyni zamanda rəhbərlik etdiyi institutda son vaxtlar həyata keçirilmiş struktur islahatları və bu islahatların aparılan elmi-tədqiqatların səviyyəsinə müsbət təsir etməsi barədə məlumat verib. O, istər elmi tədqiqatlar, istər təlim texnologiyaları, istərsə də dərsliklərin hazırlanması sahəsində yaxından əməkdaşlıq edilməsinin vacibliyini vurğulayıb.

Bakı Pedaqoji Kadrların İxtisasartırma və Yenidənhazırlanma İnstitutunun direktoru, professor Asəf Zamanov çıxış edərək konfransın aktual mövzuya həsr olunduğunu bildirib, xüsusilə də, dərslik siyasəti sahəsində əməkdaşlığın daha da genişləndirilməsini vacib sayıb.

Qafqaz Universitetinin rektoru, professor Əhməd Sanıç konfransda müasir dövrdə müəllim hazırlığına qoyulan tələblərdən danışıb. Professor Ə.Sanıç bildirib ki, müəllim hərtərəfli biliyə, yüksək intellekt səviyyəsinə, müasir və geniş dünyagörüşə, zəngin daxili mənəvi aləmə malik olmalıdır. Hər bir müəllim tədris etdiyi fənni şagirdlərə sevdirməyi bacarmalı, şagirdləri şəxsiyyətyönümlü yetişdirməlidir.

Qeyd edək ki, konfransın plenar iclasında Azərbaycan təhsilinin müasir aktual problemləri, o cümlədən müəllim hazırlığı ilə bağlı 16 çıxış, bölmə iclaslarında isə 10 bölmə üzrə 100-dək məruzə və çıxışlar dinlənilib. Plenar iclasda professor Məlikməmməd Cəbrayılov, professor Abdulla Mehrabov, professor Mirzəli Murquzov, professor Yusif Əhmədov, professor Ələkbər Qurbanov, professor Maqsud Nəcəfov, professor Buludxan Xəlilov, professor Oqtay Sultanov, professor Fərrux Rüstəmov, professor İbrahim Bayramov, professor Jalə Qədimova, dosent Mətanət Əsgərova, dosent Şəhla Əliyeva, dosent Arif Mustafayev təhsil sahəsində qazanılan uğurlar, bu sahənin əsas inkişaf istiqamətləri, həmçinin müəllim hazırlığı ilə bağlı öz fikir və mülahizələrini bölüşüblər. Konfransda həmçinin professor Ələkbər Qurbanov, professor Edil Eyvazov, dosent Yaşar Hüseynəliyev və başqaları çıxış edərək konfransın təhsil sahəsinin inkişafına müsbət təsir edəcəyini vurğulayıblar.

İki gün davam edən konfransda Bakı Dövlət Universitetinin (BDU), Azərbaycan Müəllimlər İnstitutunun (AMİ), Təhsil Problemləri İnstitutunun, Qafqaz Universitetinin, Qərb Universitetinin və digər ali təhsil müəssisələrinin professor-müəllimləri, həmçinin AMEA-nın müvafiq elmi-tədqiqat institutlarının alim və mütəxəssisləri iştirak ediblər.

**Mənsur QÜDRƏTOĞLU,**
**Könül NƏZƏROVA**

# ADPU-da “Çanaqqala zəfəri və şəhidlərimizi anma” adlı tədbir keçirilib




Mart ayının 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük zalında Çanaqqala zəfərinin 100-cü ildönümünə həsr olunmuş “Çanaqqala zəfəri və şəhidlərimizi anma” adlı tədbir keçirilib. Tədbirdə ilk olaraq Çanaqqala savaşında, eləcə də Türkiyənin və Azərbaycanın ərazi bütövlüyü və dövlət müstəqilliyi uğrunda həlak olmuş bütün şəhidlərimizin əziz xatirələri bir dəqiqəlik sükutla yad edilib, hər iki ölkənin dövlət himnləri səsləndirilib. ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədov tədbiri giriş sözü ilə açaraq toplantının keçirilməsinə görə universitetin Tələbə Gənclər Təşkilatına (TGT) və Türkiyəli Tələbələrin İdarə Heyətinə təşəkkürünü bildirib.

Rektor Y.Məmmədov öz çıxışında qeyd edib ki, ümummilli liderimiz Heydər Əliyev Türkiyə ilə dostluq və qardaşlıq münasibətlərinə böyük qayğı və diqqətlə, xüsusi həssaslıqla yanaşırdı. Ulu Öndərimizin məşhur “Biz bir millət, iki dövlətik” ifadəsi ortaq tarixi köklərə, mədəniyyətə malik olan iki qardaş xalq arasında mənəvi-siyasi birliyin əyani təcəssümüdür. Müasir Türkiyənin memarı və qurucusu, ilk prezidenti Mustafa Kamal Atatürkün “Azərbaycanın sevinci bizim sevincimiz, kədəri bizim kədərimizdir”ifadəsi də bizim dostluq və qardaşlığımızı özündə dolğun ifadə edir. Məlum olduğu kimi, işğalçı və təcavüzkar Ermənistan bu il aprel ayının 24-də uydurma “erməni soyqırımı”nın 100-cü ildönümünü keçirmək istəyir. Bu məqsədlə ermənilər dünyanın aparıcı dövlətlərinin liderlərini Yerevana toplamağa çalışırlar. Qardaş Türkiyə də öz növbəsində aprelin 24-də Ankarada Çanaqqala zəfərinin 100-cü ildönümünü qeyd etməyi planlaşdırır. Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyev də həmin mərasimə dəvətlidir. Bu, ermənilərə və onların havadarlarına verilən tutarlı bir cavabdır. Çünki Azərbaycan torpaqlarının 20 faizindən çoxunu işğal altında saxlayan, 1 milyondan çox soydaşımızı öz torpağında məcburi köçkün edən, xalqımıza qarşı Xocalı soyqırımı kimi dəhşətli bir faciəni törədən ermənilərin, əslində, buna heç bir haqqı yoxdur. Lakin çox təəssüflər olsun ki,dünyanın böyük dövlətləri, nüfuzlu beynəlxalq təşkilatlar bu məsələyə ikili standartlardan yanaşaraq xalqımızın hüquqlarının tapdalanmasına şərait yaradırlar. Lakin haqsızlıq, ədalətsizlik bütün hallarda nəticə etibarilə məğlubiyyətə məhkumdur.






Rektor Y.Məmmədov öz çıxışına davam edərək bildirib ki, bu gun bütün Türk dünyasının tarixinə böyük qəhrəmanlıq və hərbi şücaət salnaməsi kimi daxil olmuş Çanaqqala zəfərindən 100 il keçir. Çanaqqala zəfəri haqqında danışmaq üçün ilk növbədə, təbii ki, həmin dövrün tarixi-siyasi şəraitinə diqqət yetirmək vacibdir. Çanaqqala döyüşü Birinci Dünya müharibəsi illərində (1914-1918), daha dəqiq desək, 1915-1916-cı illərdə Osmanlı dövləti ilə İttifaq dövlətləri (İngiltərə, Fransa və s.) arasında dənizdə və quruda aparılan nəhəng bir döyüş olmuşdur. Həmin dövrdə İttifaq dövlətləri Osmanlı dövlətinin paytaxtı İstanbulu işğal edərək boğazları ələ keçirmək və bununla da Rusiya üçün etibarlı bir ticarət və hərbi yol açmaq istəyirdilər. Eyni zamanda onlar Almaniyanın müttəfiqlərindən biri olan Osmanlını zəiflətmək məqsədilə Çanaqqalanı hədəf seçmişdilər. Çünki Çanaqqala çox böyük iqtisadi və strateji əhəmiyyət daşıyırdı. Belə ki, Avropa cəbhələrindəki hadisələr İngiltərə və Fransanı müttəfiqləri Rusiyanı dəstəkləmək məcburiyyətində qoymuşdu. Doğrudur, Rusiya Almaniyaya güclü hərbi təzyiq edə bilmirdi. Rusiyanın sənayesi zəif idi, elə buna görə də, ingilis və fransız dəstəyinə ehtiyac yaranmışdı. Fransa və İngiltərənin isə bu dəstəyi təmin edə bilməsi üçün 4 yol var idi. Şimal nəqliyyat xəttlərindən 2-si keçilməz idi. Şimal dənizi ilin çox böyük hissəsində donduğu üçün dəniz nəqliyyatının hərəkəti mümkünsüz idi, Baltik dənizi isə alman donanmasının nəzarətində idi. Orta nəqliyyat yolu olan Avropa quru yolu da almanların nəzarəti altında idi. Dördüncü yol isə Osmanlı dövlətinin nəzarətində olan Çanaqqala və İstanbul boğazlarından keçən dəniz yolu idi. Avropalılar zəif hesab etdikləri Osmanlı dövlətini Boğazlardan yalnız bir hücumla qovacaqlarını düşünürdülər. Bu, bir tərəfdən Rusiyanın dəstəklənməsi demək idisə, digər tərəfdən, məğlubiyyətə uğramış Osmanlı dövlətinin öz müttəfiqi olan Almaniyanı itirməsi demək idi. İngilis və fransızlar qələbə çalacaqları təqdirdə Osmanlının əlində olan Süveyş kanalı Böyük Britaniyanın Uzaq Şərqə nəqliyyat yolunu açacaqdı. Rusiya ilə Qara dəniz üzərindən dəniz nəqliyyatının açılması və Boğazların ələ keçirilməsi ingilis və fransız firmalarına böyük qazanclar gətirəcəkdi.

Elə bu səbəblərə görə də 19 fevral 1915-ci ildə güclü fransız qüvvələri və Böyük Britaniyanın Elizabet döyüş gəmisi Osmanlı sahil qüvvələrini bombalayaraq Çanaqqalaya ilk hücumu başladılar. Çanaqqalanın işğal edilməsi bütünlükdə Osmanlı dövlətinin tamamilə məhv edilməsi demək idi. Yəni bu döyüş faktiki olaraq Osmanlı dövləti üçün bir ölüm-dirim məsələsi idi. Lakin İttifaq dövlətlərinin qoşunlarının çoxsaylı hücumları uğursuzluqla nəticələnmişdir. Belə ki, Antantaya üzv olan dövlətlərin müasir döyüş texnikası ilə təchiz edilmiş böyük sayda canlı qüvvəsi çoxsaylı hücumlara baxmayaraq, qəhrəman Türk əsgəri tərəfindən geri otuzdurulmuşldur. Hər iki tərəf çox böyük itkilər vermişdir. Məşhur Çanaqqala döyüşü məhv olma vəziyyətinə gətirilmiş Osmanlı dövlətinin bir möhtəşəm qələbəsi kimi tarixə düşmüş, hər bir vətəndaşın xatirəsində qalmışdır. Digər tərəfdən, Çanaqqala zəfəri Türk xalqının, Türk millətinin tarixin ən



**(Davamı 4-cü səhifədə)**

# Təhsil dövlət siyasətinin prioritetləri sırasında ilk yerlərdən birini tutur



***Son illərdə ölkə Prezidenti cənab İlham Əliyevin həyata keçirdiyi düşünülmüş və uzaqgörən siyasət sosial həyatımızın bütün sahələrinin, o cümlədən elm və təhsilin tərəqqisinə güclü təkan verib. Bu bir reallıqdır ki, müasir dövrdə ölkələrin tərəqqisi elm və təhsilin inkişafı ilə birbaşa bağlıdır. Dünya təcrübəsi göstərir ki, istənilən dövlətin inkişaf səviyyəsini ölkənin təbii sərvətlərinin bolluğu deyil, bu sərvətlərin yüksək potensiala malik insan kapitalına çevrilməsi, bilik iqtisadiyyatının formalaşması müəyyən edir.***

2015-ci ilin başlanğıcı ölkə təhsili üçün uğurlu oldu. Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin sərəncamları ilə "Dövlət ümumi təhsil müəssisələrində çalışan, bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əməkhaqqının artırılması haqqında" və "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı"nın təsdiq olunması bu baxımdan xüsusilə mühüm əhəmiyyətə malikdir.

Ölkə başçısının təhsilə, təhsil ictimaiyyətinə hər zaman göstərdiyi həssas münasibət baxımından dövlət ümumi təhsil müəssisələrində çalışan, bilik və bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əməkhaqqının artırılması böyük qayğının nəticəsi idi. Region ölkələrində büdcənin sosial xərclərinin azaldıldığı və dünya bazarında neftin qiymətinin endiyi bir vaxtda belə bir qərarın verilməsi əlbəttə ki, gözlənilməz oldu. Bu, bizim üçün - təhsil işçiləri üçün böyük bir hədiyyə olmaqla yanaşı, eyni zamanda, təhsil ictimaiyyətinin üzərinə böyük məsuliyyət qoyur.

Ölkə Prezidentinin "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nın həyata keçirilməsi ilə bağlı Fəaliyyət Planı"nın təsdiq edilməsi haqqında 19 yanvar 2015-ci il tarixli sərəncamı bu ilin təhsil sisteminin inkişafı baxımından dönüş ili olacağını deməyə əsas verir. Dövlət Strategiyasının Fəaliyyət Planında təhsilin bütün pillə və səviyyələri üzrə gələcək tədbirlərin icrası ilə bağlı dəqiq və əhatəli istiqamətlər əksini tapıb.

İlk növbədə qeyd etməliyik ki, təhsil sistemində keyfiyyətin yüksəldilməsi, kadr potensialının səriştə və kompetensiya baxımından gücləndirilməsi, şəffaflığın təmin edilməsi, müasir idarəetmə modelinin tətbiqi və digər istiqamətlər üzrə islahatların intensivləşdirilməsi məqsədlərinə xidmət edən bu qərar bir daha dövlət siyasətinin prioritetlərini və ölkə rəhbərinin təhsilə olan xüsusi qayğısını əks etdirir. Təsadüfi deyil ki, cənab İlham Əliyev üçüncü dəfə ölkə Prezidenti seçiləndən sonra imzaladığı ilk sənədlərdən biri "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" olub.

2014-cü ildə təhsil sahəsində islahatlar və tədbirlər uğurla davam etdirilib. Azərbaycanın müstəqillik illərində aktual sahə kimi yanaşılan məktəbəqədər təhsilə dövlət tərəfindən xüsusi diqqət və qayğı göstərilir. Məktəbəqədər təhsil sahəsində mövcud olan problemlərin aradan qaldırılması, təhsilin müasir tələblər səviyyəsində qurulmasının təmin olunması istiqamətində kompleks tədbirlər yerinə yetirilir.

Dövlət məktəbəqədər təhsil müəssisələri şəbəkəsinin genişləndirilməsi ilə yanaşı, özəl sektorun da bu sahədəki inkişafı böyük əhəmiyyət kəsb edir. Yeni qəbul olunmuş "Körpələr evlərinə, körpələr evi-uşaq bağçalarına, uşaq bağçalarına, xüsusi uşaq bağçalarına və uşaq evlərinə müddətli vergi güzəştlərinin verilməsi haqqında" qanuna əsasən 2014-cü il yanvarın 1-dən başlayaraq 10 il müddətinə məktəbəqədər təhsil müəssisələri Vergi Məcəlləsi ilə müəyyən edilmiş hüquqi şəxslərin mənfəət vergisini və sadələşdirilmiş vergini ödəməkdən azad ediliblər. Bu isə uşaqların intellektual, fiziki və psixoloji inkişafı üçün lazımi şəraitin yaradılması ilə yanaşı, bu sahənin inkişafının təkcə dövlət sərmayələri ilə deyil, həmçinin özəl sektorun iştirakının stimullaşdırılması yolu ilə təmin etmək məqsədi daşıyır.

Dövlət Strategiyasında ölkə üzrə azyaşlı uşaqların məktəbəqədər təhsilə cəlbolunma səviyyəsinin orta Avropa göstəricisi səviyyəsinə çatdırılması əsas məqsəd kimi qoyulur. Buna nail olmaq üçün isə məktəbəqədər təhsil müəssisələri şəbəkəsinin genişləndirilməsi, onların şərait və təchizatının yaxşılaşdırılması, habelə bu sahədə müxtəlif tipli, məsələn, icma və ailə tipli müəssisələrin yaradılmasına xüsusi önəm verilir.

Təhsil Nazirliyi tərəfindən ümumi təhsil məktəblərində məktəbəhazırlıq qruplarının yaradılması üçün tədbirlər görülür. Paytaxtın 89 ümumi təhsil müəssisəsində məktəbəqədər hazırlıq qrupları fəaliyyətə başlayıb. Bu qruplar uşaqların tədrisə hazırlıqlı başlaması və ilkin bilikləri əldə etməsi məqsədlərinə xidmət edir. Bu qruplara cəlb edilən uşaqların vaxtından əvvəl I sinfə müsahibəsiz qəbul olunması barədə qərar qəbul olunub.

Dövlət Strategiyasında eyni zamanda, məktəbəqədər təhsil üzrə kurikulumun tətbiqinin sürətləndirilməsi zəruri hesab edilir. Kurikuluma əsasən məktəbəqədər təhsil uşağın ətraf aləmlə harmoniyasını təmin etməyə, xeyirxah hisslər oyatmağa, əməkdaşlığa və müsbət özünütəsdiqə nail olmaq baxımından əhəmiyyətlidir.

"Məktəbəqədər təhsilin proqramı (kurikulumu)"nın pilot qaydasında tətbiqi məqsədilə respublikanın 15 pilot şəhər və rayonunda məktəbəqədər təhsil müəssisələrinin pedaqoji işçiləri üçün təlimlər keçirilib. Bu təlimlərdən 3093 tərbiyəçi keçib. Bu il təlimlərin bütün məktəbəqədər təhsil müəssisələrinin pedaqoji işçiləri üçün təşkil olunması nəzərdə tutulur.

Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti Mehriban Əliyevanın rəhbərliyi ilə fond yeni layihəyə - məktəbəqədər təhsil müəssisələrinin inkişafı proqramına start verib. Proqramda ölkə üzrə məktəbəqədər təhsil müəssisələrinin genişmiqyaslı tikintisi, yenidənqurulması və əsaslı təmirinin dəstəklənməsi nəzərdə tutulur.

Ümumi təhsil sahəsində həyata keçiriləcək islahatların əsas prioritetlərinə uyğun olaraq, sağlam və səmərəli təhsil mühitinin yaradılması, təhsilin keyfiyyətinin yüksəldilməsi və məktəblərin idarəedilməsinin müasir tələblər səviyyəsinə çatdırılması istiqamətlərində fəaliyyət 2014-cü il ərzində də uğurla davam etdirilib.

Ölkəmizdə ilk dəfə olaraq ümumi təhsil müəssisələrində işləyən müəllimlərin peşəkarlıq səviyyəsinin qiymətləndirilməsi və əlavə təlim ehtiyaclarının müəyyənləşdirilməsi məqsədilə 10-13 iyun və 20 sentyabr 2014-cü ildə Bakı şəhərinin dövlət ümumi təhsil məktəblərində çalışan 30 mindən çox müəllimin bilik və səriştəsinin diaqnostik qiymətləndirilməsi keçirilib. Diaqnostik qiymətləndirmənin nəticələrinə əsasən pilot layihə kimi xüsusi elektron qaydada dərs bölgüsü aparan proqram hazırlanaraq 20 məktəbdə sınaqdan keçirilib. Bununla yanaşı, qiymətləndirmənin nəticələri bütün ümumi təhsil məktəblərində dərs bölgüsü zamanı nəzərə alınıb.

Bakıdakı məktəblərdə çalışan 30 min müəllimin dərs yükü orta hesabla 18 saat civarındadır. Odur ki, müvafiq sərəncamın icrası çərçivəsində heç bir müəllimin ixtisarı nəzərdə tutulmur.

Qeyd etdiyim kimi, Prezident İlham Əliyev tərəfindən müəllimlərin bilik və səriştəsinin diaqnostik qiymətləndirilməsinin nəticələri nəzərə alınaraq, bu prosesdə iştirak etmiş müəllimlərin dərs yükü və əməkhaqqı artırılıb. Dövlət başçısının sərəncamı təhsil ictimaiyyəti tərəfindən rəğbətlə qarşılanıb, pedaqoji sahədə çalışanların ruh yüksəkliyinə səbəb olub. Müəllimlərin həm dərs yükünün, həm də əməkhaqqının artırılması ehtiyacı sistemin qeyri-optimal olmasından qaynaqlanırdı.

Hər zaman müəllimlərin əməkhaqqının artırılması məsələsi müzakirə olunarkən bunun icrası yolları və forması əsas suallardan biri kimi qarşıda dururdu. Düşünürdük ki, əməkhaqqı artımı, ilk növbədə, təhsilin keyfiyyətinin yüksəldilməsinə xidmət etməlidir.

Bu sərəncama nəzər salarkən aydın şəkildə görünür ki, dövlət başçısı üçün insan kapitalının inkişafı nə dərəcədə vacibdir. Sözsüz ki, hər bir ölkənin ən böyük sərvəti insanlardır. İnsan kapitalının inkişafı daha rəqabətli, Azərbaycanın maraqlarını hər bir sahədə - iqtisadi, sosial və siyasi sahədə daha uğurla təmsil etməyi bacaran insanların yetişdirilməsindən ibarətdir.

Bütün bu məsələlərin həlli üçün aparılan müzakirələrdə təhsil sisteminin səmərəli fəaliyyət imkanları tapıldı və ən qısa müddətdə təhsil alanların bunu hiss etməsi üçün yollar müəyyənləşdirildi. Növbəti mərhələdə isə diaqnostik qiymətləndirmə ilə ölkəmizin bütün regionlarında çalışan müəllimlərin əhatə edilməsi nəzərdə tutulub.

Yeri gəlmişkən onu da qeyd edim ki, hazırda qanunvericiliyə uyğun olaraq, regionlardakı ucqar kənd məktəblərində çalışan bir çox müəllimlərə əlavə ödənişlər və əlavə güzəştlər tətbiq olunur. Belə ki, Təhsil Nazirliyinin təklifləri nəzərə alınaraq Nazirlər Kabinetinin qərarı ilə "Pedaqoji profilli ixtisaslar üzrə ali və orta ixtisas təhsili müəssisələrini bitirmiş və ümumi təhsil müəssisələrində işə başlamış gənc mütəxəssislər üçün əlavə güzəştlər və stimullaşdırıcı tədbirlərin müəyyən edilməsi haqqında" Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il 14 aprel tarixli 67 nömrəli qərarında dəyişikliklər edilib. Həmin qərar nəticəsində müvafiq təhsil müəssisələrindəki vakansiyaların azaldığını müşahidə edirik. Bütün bunlar təhsil sistemində kadr potensialının optimallaşdırılması üçün tətbiq olunan təşviq mexanizmlərindən biridir.

Təhsil sisteminin optimallaşdırılmasına uyğun olaraq, müəllim-şagird nisbətinə diqqət yetirilməsi olduqca vacib məsələlərdəndir. Bu gün region ölkələri ilə müqayisədə Azərbaycanda bir müəllimə düşən şagird sayı göstəricisi daha aşağıdır. Müəllimlərin dərs yükünün müvafiq həddə çatdırılması ilə müəllim-şagird nisbəti də normal məcraya düşəcəkdir.

Bacarıqlarının diaqnostik qiymətləndirilməsi aparılan müəllimlərin dərs yükünün və əməkhaqqının artırılmasını prosesin ilk mərhələsi kimi səciyyələndirə bilərik. Növbəti mərhələdə isə müəllimlərin fəaliyyət keyfiyyətinə, bilik və bacarıqlarının səviyyəsinə görə diferensial əməkhaqqının müəyyənləşdirilməsi nəzərdə tutulur.

Müəllimləri maraqlandıran bir məsələyə də toxunum ki, paytaxt məktəblərində çalışan, diaqnostik qiymətləndirilmədə hər hansı bir səbəbdən iştirak etməmiş müəllimlərə də bu prosesi keçmək imkanı yaradılacaqdır.

Təhsilin inkişafı ilə bağlı beş əsas istiqaməti ehtiva edən "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası"nda da təhsilverənlərə, yəni müəllimlərə xüsusi yer ayrılır.

Məlumdur ki, hər bir təhsil sisteminin səviyyəsi bu sahədə çalışan müəllimin gücündən artıq ola bilməz. Bu baxımdan müəllimlərin bilik və bacarıqlarının artırılması, müəllim nüfuzunun yüksəldilməsi, istedadlı gənclərin pedaqoji sahədə çalışmaq üçün stimullaşdırılması yönündə Təhsil Nazirliyi tərəfindən bir sıra addımlar atılmaqdadır. Sevindirici haldır ki, müəllimlərin böyük bir qismi yeniliklərin tətbiqindən məmnundur və islahatlara həvəslə dəstək verirlər.

Məlum olduğu kimi, Təhsil Nazirliyi tərəfindən ilk dəfə 2014-2015-ci tədris ilindən pedaqoji kadr hazırlığı aparılan ali təhsil müəssisələrinə qəbul imtahanlarında 500 və daha yüksək bal toplayan, ixtisas seçimində birinci və ya ikinci yerdə müəllimlik ixtisasını qeyd edən 300 tələbəyə "Gələcəyin müəllimi təqaüdü" verilib. Təqaüdün təsis edilməsi peşəkar bilik və kompetensiyalara malik pedaqoji kadrların hazırlanmasına, müəllim peşəsinin nüfuzunun yüksəldilməsinə xidmət edir.

Hesab edirəm ki, cəmiyyətdə müəllim nüfuzunun yüksəldilməsi üçün ilk növbədə təhsilə, tərbiyəyə, böyüklərə və müəllimlərə hörmətə xüsusi yer verilən milli dəyərlərimizi qorumalıyıq. Təhsil Nazirliyi gənclərdə bu peşəyə marağı artırmağa çalışır. Bu istiqamətdə dövlət başçısının tapşırığı ilə pedaqoji universitetin kampusunun layihəsi hazırlanır. Orada gələcək müəllimlərin dünyagörüşünün formalaşdırılması və keyfiyyətli təhsil almaları üçün səmərəli mühit yaradılacaqdır.

Məqsədyönlü dövlət siyasətinin nəticəsidir ki, son 11 il ərzində Azərbaycanda 3000-ə yaxın ümumtəhsil müəssisəsi tikilib və ya əsaslı təmir olunub. Müqayisə üçün qeyd edək ki, ərazisinə və iqtisadi imkanlarına görə Azərbaycandan üstün olan, sürətlə inkişaf edən Qazaxıstanda isə bu dövrdə 700 məktəb inşa olunub.

2014-cü ildə Təhsil Nazirliyinin sifarişi ilə 3 dövlət təhsil müəssisəsi tikilib, 2 təhsil müəssisəsində əsaslı təmir işləri aparılıb, 94 tədris ocağı isə cari təmir edilib. 2015-ci ildə isə 92 təhsil müəssisəsi üçün yeni binanın tikintisi, 64 təhsil müəssisəsinin binasının əsaslı təmir olunması və 50 təhsil müəssisəsində isə cari təmir işlərinin aparılması nəzərdə tutulub.

Ötən il əsas məqsədi istedadlı şagirdlərin seçilib inkişaf etdirilməsi və şagirdlərin olimpiadalara mütəşəkkil və davamlı şəkildə hazırlanmasının təşkilindən ibarət olan İnformatika üzrə Olimpiada Mərkəzi açılıb. Həmçinin Təhsil Nazirliyinin təşəbbüsü ilə riyaziyyat və təbiət elmləri üzrə fənn müsabiqələri keçirilib.

2014-2015-ci tədris ilindən "Sağlam təhsil-sağlam millət" layihəsi çərçivəsində ölkəmizin 6 ümumi təhsil məktəbində 15 pilot "Sağlam təhsil sinfi" fəaliyyət göstərir. "Sağlam təhsil-sağlam millət" layihəsinin məqsədi təhsilalanların təlim nailiyyətlərini yüksəltməklə yanaşı, tədris şəraitindən irəli gələn hərəkət məhdudiyyətini və digər amilləri aradan qaldırmaq, onların sağlamlığını qorumaqdan ibarətdir.

Keyfiyyətli təhsildən danışırıqsa, müvafiq tələblərə cavab verən tədris resursları və dərsliklər əsas yerlərdən birini tutur. Bu baxımdan qarşıda duran vəzifələri yerinə yetirmək üçün Təhsil Nazirliyi tərəfindən kompleks işlər görülməkdədir. Belə ki, Dərslikləri Qiymətləndirmə Şurasının müsabiqə əsasında yeni tərkibi formalaşdırılıb. 2014-cü ildə ilk dəfə olaraq Azərbaycanda maksimum adda və sayda - 271 adda 7,8 milyon ədəd dərslik çap olunub. Bəzi siniflər üçün tam yeni, qalanları üçün təkrar nəşr olunan bu kitablar vaxtında bütün məktəblərə çatdırılıb. Dərsliklərin satış məqsədilə çap edilməsindən əldə olunan gəlirin istifadəsi barədə müvafiq qərara əsasən, dərsliklərin əlavə nəşrindən Təhsil Nazirliyinin hesabına daxil olan vəsaitin 50 faizinin dərslik müəlliflərinə ödənilməsi nəzərdə tutulub.

Növbəti dərs ili üçün VIII sinif dərsliklərinin hazırlanması üzrə tender bir il əvvəl elan edilib. Tender proseduru üzrə təqdim edilən və qalib gələn dərsliklər məhdud sayda çap edilərək pilot məktəblərdə sınaqdan keçirilir. İrad və təkliflər nəzərə alındıqdan sonra çap edilib növbəti dərs ilinin başlanmasından xeyli əvvəl məktəblərə paylanacaqdır. Həmçinin növbəti tədris ili üzrə IV sinif dərslikləri əsaslı şəkildə təkmilləşdirilərək çap ediləcək, ümumtəhsil məktəblərinin IX sinifləri üçün bir il əvvəlcədən dərsliklərin hazırlanması üzrə tender elan ediləcək. Həmin dərsliklər 2016-2017-ci dərs ilindən istifadəyə veriləcək.

"Ümumtəhsil müəssisələrinə və peşə liseylərinə müəllimlərin yerdəyişməsi və işə qəbulu Qaydaları"na müvafiq olaraq hazırda işləyən müəllimlərin bir rayondan (şəhərdən) digər rayona (şəhərə) yerdəyişməsi ilk dəfə olaraq ötən il Təhsil Nazirliyi tərəfindən mərkəzləşdirilmiş qaydada müsabiqə yolu ilə həyata keçirilib. İş yerini dəyişmək üçün 1149 nəfər müəllim elektron ərizə verib. Yekun nəticəyə əsasən 96 nəfər iş yerini dəyişmək hüququ qazanıb.

2014-2015-ci tədris ilində ümumi təhsil müəssisələrinə və peşə liseylərinə müəllimlərin işə qəbulu üzrə müsabiqənin nəticələrinə əsasən ümumilikdə 1692 nəfər işə qəbul olunub ki, onlardan 1405 nəfərinə (83 faiz) həvəsləndirmə tədbirləri tətbiq edilib. Vakansiyaların tutulma səviyyəsi ötən dərs ilinə nisbətən 40 faiz artıb. 2014-2015-ci tədris ilində yeni işə qəbul olunan pedaqoji işçilər ilk dəfə "Müəllim andı" içərək fəaliyyətə başlayıb.

Kənd məktəblərində ciddi ehtiyac duyulan kimya, fizika, biologiya və coğrafiya fənləri üzrə işə qəbul olunanların sayında artım olub. Belə ki, coğrafiya fənni üzrə 230, fizika fənni üzrə 175, biologiya fənni üzrə 161, kimya fənni üzrə 89 nəfər işə qəbul olunub.

Məktəb direktorları və məktəb direktoru olmaq arzusunda olan digər şəxslər üçün müasir peşə standartları əsasında təlimlər təşkil edilib. Təlimlərdən uğurla keçmiş və keyfiyyət sertifikatı almış 15 nəfər paytaxtdakı ümumtəhsil müəssisələrinə direktor təyin olunub. Artıq ümumtəhsil müəssisələrində təlim-tərbiyə işləri üzrə direktor müavini, tərbiyə işləri üzrə direktor müavini (təşkilatçı) və laborant vəzifələrinə işə qəbul olunmaq üçün keçirilən ikinci müsabiqə başa çatmaq üzrədir.

2014-2015-ci tədris ilindən ölkəmizin ümumtəhsil müəssisələrində pedaqoji kadrlara olan tələbat nəzərə alı-

**(Davamı 4-cü səhifədə)**

# Təhsil dövlət siyasətinin prioritetləri sırasında ilk yerlərdən birini tutur

(Əvvəli 3-cü səhifədə)

naraq yenidənhazırlanma təhsili üzrə ixtisasların sayı artırılıb və yeni ixtisaslar üzrə müəllim hazırlıqlarına başlanılıb. Bu sıraya riyaziyyat-informatika, kimya-biologiya, tarix-coğrafiya ixtisasları daxildir.

Məktəblilərin vətənpərvərlik tərbiyəsinin daha yaxşı təşkili məqsədilə 2014-2015-ci tədris ilindən ümumtəhsil məktəblərinin VIII siniflərində "Qarabağın tarixi" adlı fakültativ kurs tədris olunur.

2014-cü ilin fevral-may aylarında rayon və şəhərlərdəki ümumtəhsil məktəblərinin XI sinif şagirdləri üçün Heydər Əliyev mərkəzlərində "Müstəqil Azərbaycan tarixi" mövzusunda əlavə dərslər tədris olunub. Dərslər şagirdlərə müasir Azərbaycan tarixi haqqında daha dolğun və əhatəli məlumatların verilməsi məqsədilə təşkil edilib. Müvafiq istiqamətdə təlimin keyfiyyətinin yüksəldilməsi və məktəblilərin potensial imkanlarının üzə çıxarılması baxımından mühüm əhəmiyyət kəsb edən dərslər, eyni zamanda şagirdlərin milli-mənəvi dəyərlərə malik, sağlam əqidəli, vətənpərvər, müasir dünyagörüşlü şəxsiyyət kimi formalaşmasına və yetkin vətəndaş kimi müstəqil həyata hazırlanmasına xidmət edir. Qeyd olunan dərsləri tədris edəcək müəllimlər və dərslərin mövzuları əvvəlcədən müəyyənləşdirilib. Həmçinin müəllimlərə kömək məqsədilə müvafiq tezislər və tövsiyələr hazırlanıb.

İnternat məktəblərdə təhsil alan uşaqlara qayğı ildən-ilə artır. Heydər Əliyev Fondunun gördüyü işlər nəticəsində internat məktəblərinin bir çoxu əsaslı tikinti və yenidənqurmadan sonra yeni görkəm alıb. Hazırda Bakı şəhərində yerləşən 3 internat məktəbində əsaslı təmir və tikinti işləri aparılır, 4 internat məktəbində isə cari ildə təmir işlərinə başlanılması nəzərdə tutulur.

Təhsil müəssisələrinin İKT avadanlıqları ilə təminatı istiqamətində 2014-cü il ərzində də təsirli tədbirlər görülüb. Təhsil müəssisələrinə 6000 ədəd kompüter, 3000 ədəd nooutbuk, 700 ədəd proyektor, 1377 ədəd elektron lövhə verilib. 200 təhsil müəssisəsi genişzolaqlı internet xəttinə qoşulub.

Ötən ilin ən böyük uğurlarından biri də elektron dərslik portalının (www.e-derslik.edu.az) istifadəyə verilməsi olub. Portal təhsilalanların dərslikləri elektron formatda oxumasına imkan yaradır. Məktəblilər portal vasitəsilə istənilən vaxt və məkanda dərsliklərə müraciət edə biləcəklər. Bu sistem təhsilalanların dərsliklərdən istifadəsində mobilliyi artıracaq, onların öyrənmə prosesinin fərdiləşməsinə şərait yaradacaqdır. Həmçinin elektron resursları bir mənbədə cəmləşdirmək üçün www.e-resurs.edu.az portalı yaradılıb. Portal vasitəsilə hər bir istifadəçi elektron dərsliklər, videodərslər, müsabiqələr, elektron tapşırıqlar, müxtəlif oyunlar və digər bu kimi təhsil resurslarına çıxış əldə edə bilər.

Təhsil Nazirliyi tərəfindən kənd təsərrüfatı sahəsi üzrə ixtisaslaşmış ilk peşə-ixtisas təhsili müəssisələrinin maddi-texniki və tədris bazasının müasir tələblərə uyğunlaşdırılması məqsədilə yeni texnika, avadanlıq, əyani və texniki vasitələrin alınması prosesinə start verilib. Belə ki, İsmayıllı Peşə Tədris Mərkəzi, Balakən 1 nömrəli Peşə Məktəbi, Cəlilabad Peşə Liseyi, Bərdə Peşə Liseyi, Quba Peşə Liseyi, Şamaxı Peşə Liseyi, Göyçay Peşə Liseyi üçün 6 traktor, 4 otbağlayan, 7 traktor qoşqusu, 5 kotan, 6 toxumsəpən, 3 otbiçən, 3 taxıl və qarğıdalıyığan kombayn, 3 dərmançiləyici, 2 gübrəsəpən, 1 yemüyüdən texnika alınıb. İlk peşə-ixtisas təhsili müəssisələrinə sonuncu dəfə belə texnika və avadanlıqlar 25-30 il əvvəl verilib.

Avtomobil nəqliyyatı ixtisası üzrə kadr hazırlayan ilk-peşə ixtisas təhsili müəssisələrinə 11 ədəd "Renault Logan" markalı nəqliyyat vasitəsi verilib. Bütün bunlar müvafiq sahədə fəaliyyət göstərən ilk-peşə ixtisas təhsili müəssisələrinin maddi-texniki bazasının müasir tələblərə uyğunlaşdırılması, mütəxəssis hazırlığı işinin səmərəliliyinin artırılması məqsədlərinə xidmət edir.

Azərbaycan Respublikası Hökuməti və Koreya Respublikası Hökuməti arasında Peşə Tədris Mərkəzinin yaradılması layihəsi üzrə Kredit Sazişi imzalanıb. Layihənin büdcəsi 39,28 milyon ABŞ dolları təşkil edir. Bu vəsaitin 22 milyonu Koreya İqtisadi İnkişaf və Əməkdaşlıq Fondu tərəfindən maliyyələşdiriləcəkdir. Təhsil Nazirliyi və Norveçin Roqaland Təlim və Təhsil Mərkəzi Fondu arasında Əməkdaşlıq Memorandumu imzalanıb. Bu layihə çərçivəsində pilot olaraq bir neçə peşə məktəbində yeni idarəetmə modelinin tətbiqi, tədris materiallarının hazırlanması, mühəndis-pedaqoji heyət üçün yeni ixtisasartırma, yenidənhazırlanma və ixtisasdəyişmə modelinin tətbiqi, normativ-hüquqi bazanın təkmilləşdirilməsi sahəsində birgə tədbirlərin həyata keçirilməsi nəzərdə tutulur.

Təhsil Nazirliyi ilə Sahibkarlar (İşəgötürənlər) Təşkilatları Milli Konfederasiyası, "Azərbaycan Polad İstehsalı Kompleksi" Qapalı Səhmdar Cəmiyyəti və Azərbaycan Qızıl Aypara Cəmiyyəti arasında ikitərəfli anlaşma memorandumları imzalanıb. Memorandumlar Təhsil Nazirliyi ilə müvafiq qurumlar arasında əlaqələrin daha da inkişaf etdirilməsi, müasir tələblərə cavab verən kadrların hazırlanmasında birgə fəaliyyəti nəzərdə tutur.

İlk peşə-ixtisas təhsili müəssisələri üçün müasir idarəetmə bilik və bacarığına yiyələnmiş, informasiya texnologiyalarına bələd, ölkəmizin təhsil və sosial inkişafına töhfə verə biləcək direktorlar yetişdirmək və onların bacarıqlarını təkmilləşdirmək məqsədilə "Liderlik və idarəetmə" təliminə başlanılıb. Təhsil Nazirliyi, "Allianz Consult" MMC və "GİZ" Almaniya Beynəlxalq Əməkdaşlıq Cəmiyyəti tərəfindən birgə təşkil edilən ilk peşə-ixtisas təhsili müəssisələrinin direktorları və gələcəkdə bu vəzifədə çalışmaq arzusunda olan təlim iştirakçıları müsabiqə əsasında müəyyənləşdirilib.

Orta ixtisas təhsili müəssisələrində son illərdə real tələbata əsaslanmadan artırılmış qəbul yerlərinin sayı keçən tədris ilinə nisbətən azaldılaraq 15 667 yerdən 11 266 yerə endirilib. Qiyabi təhsil forması üzrə kolleclərə tələbə qəbulu planı əvvəlki tədris ilinə nəzərən 4,1 dəfə azaldılıb, "ibtidai sinif müəllimliyi" və "informatika müəllimliyi" ixtisasları qəbul planından çıxarılıb. Kolleclərə "məktəbəqədər təlim və tərbiyə" ixtisası üzrə qəbul yerləri əvvəlki tədris ilinə nisbətən 38 faiz az planlaşdırılıb. Texniki istiqamətli kolleclərdə müəllimlik ixtisasları tələbə qəbulu planından çıxarılıb.

Nazirlər Kabinetinin qərarı ilə təsdiq olunmuş "Orta ixtisas təhsili müəssisələrində kredit sistemi ilə tədrisin təşkili Qaydaları"na və Təhsil Nazirliyinin müvafiq əmrinə uyğun olaraq 2014-2015-ci tədris ilindən tələbələr kredit sistemi əsasında təhsil alır. Bununla bağlı bütün zəruri hazırlıq işləri aparılıb, 115 ixtisas üzrə kredit sisteminə əsaslanmış təhsil proqramları tətbiq edilib.

"Azərbaycan 2020: gələcəyə baxış" İnkişaf Konsepsiyasına uyğun olaraq regional kolleclərin yaradılması işinə başlanılıb. Nazirlər Kabinetinin müvafiq qərarları ilə Masallı Dövlət Regional Kolleci, eləcə də İsmayıllı Dövlət Humanitar və Texnologiya Kolleci yaradılıb.

Təhsil Nazirliyi tərəfindən 2014-cü ildə ali təhsil sahəsində həyata keçirilmiş islahatların əsas prioritetləri sırasında olan SABAH (savadlı, bacarıqlı, hazırlıqlı) qruplarının təşkili ali təhsil müəssisələrinin fəaliyyətinin effektivliyinin təmin olunması, tələbə qəbulu planının formalaşdırılmasına dair yanaşmaların təkmilləşdirilməsi, dövlət sifarişində iştirak edəcək universitetlərin seçim meyarlarının hazırlanması, ölkə iqtisadiyyatının inkişaf səviyyəsinə cavab verən müasir kadr hazırlığının təmin edilməsi, habelə ali təhsil proqramlarının (standartlarının) Avropa məkanında tətbiq olunan müvafiq sənədlərə uyğunlaşdırılması məqsədilə tədris proqramlarına (standartlarına) yenidən baxılması, abituriyentlərin peşəyönümlü ixtisas seçimi mexanizminin formalaşdırılması, orta məktəblərin, ilk peşə və orta ixtisas təhsili müəssisələrinin müvafiq ali təhsil müəssisələrinə təhkim edilməsi, aztəminatlı gənclərin ali təhsil almaq imkanlarının artırılması üçün pilot qaydasında təhsil kreditlərinin tətbiqinə başlanılması, ali təhsil müəssisələrinin fəaliyyətini tənzimləyən normativ bazanın təkmilləşdirilməsi və korporativ idarəetmə prinsiplərinin tətbiqi, dövlət ali təhsil müəssisələrində maliyyə hesabatlılığı sisteminin tətbiqinin genişləndirilməsi, ali təhsil müəssisələrinin akkreditasiya sisteminin yaradılması kimi məsələlər əsas yer tutur.

Ölkənin 7 ali məktəbində 37 ixtisas üzrə SABAH qrupları fəaliyyətə başlayıb. Hazırda 769 tələbənin təhsil aldığı bu qruplarda 158 müəllim dərs deyir. Tələbələrdən 200 nəfəri yataqxana ilə təmin olunub. Layihənin əsas hədəfi ali təhsilin yeni inkişaf istiqamətlərinin müəyyənləşdirilməsi, tədrisin təşkilində mütərəqqi forma və metodları tətbiq etməklə keyfiyyətin yüksəldilməsidir.

Təhsil Nazirliyinin təşkilatçılığı ilə ilk dəfə 1-ci SABAH Forumu keçirilib. İki günlük forumda ölkənin müxtəlif ali təhsil müəssisələrinin SABAH qruplarında təhsil alan 250 nəfərə yaxın tələbəsi iştirak edib. Forumun keçirilməsində əsas məqsəd ölkə təhsilinin strateji hədəfləri barədə ətraflı məlumatların verilməsi, müasir dövrün tələblərinə uyğun yüksək biliyə malik cəmiyyətin qurulmasında tələbələrin rolunun müəyyənləşdirilməsi və tələbələr arasında dialoqun yaradılmasından ibarətdir.

Ali təhsilin bakalavriat və magistratura səviyyələrinə 2014-2015-ci tədris ili üzrə tələbə qəbulu planında bir sıra mühüm yeniliklər tətbiq olunub. 2013-2014-cü tədris ilinin faktiki qəbuluna nisbətən Azərbaycanda fəaliyyət göstərən ali təhsil müəssisələrinə cari tədris ili üçün qəbul planı 12,9 faiz artırılıb. Qiyabi təhsil forması üzrə plan 2 dəfədən çox azaldılaraq bu yerlərin hesabına əyani tələbə qəbulu planı artırılıb.

Ali təhsil müəssisələrində magistratura səviyyəsi üzrə qiyabi təhsil forması nəzərdə tutulmayıb. Bakalavriat buraxılışı olmayan ixtisasların magistratura səviyyəsinə plan yerləri ayrılmayıb. Təhsil, texniki və texnoloji, eləcə də kənd təsərrüfatı ixtisaslarına dövlət sifarişi yerləri artırılıb. Kənd təsərrüfatı ixtisas qrupuna daxil olan ixtisaslara qəbul yalnız dövlət sifarişi əsasında aparılıb.

2014-2015-ci tədris ilindən etibarən ali təhsilin bakalavriat səviyyəsində məzunun bilik, bacarıq və vərdişlərinə qoyulan kompetensiyaları özündə əks etdirən 138 ixtisas üzrə yeni nəsil təhsil proqramlarının və buna müvafiq hazırlanmış tədris planlarının tətbiqinə başlanıb. Müəllim hazırlığı aparılan ali təhsil müəssisələrində qoşa ixtisaslar (riyaziyyat və informatika, kimya və biologiya, tarix və coğrafiya) üzrə kadr hazırlığı 5 illik tədris planları əsasında aparılır.

Ölkəmizdə ilk dəfə olaraq Azərbaycan Dövlət İqtisad Universitetində İnnovativ Biznes-İnkubatoru yaradılıb. Layihənin əsas missiyası gənc menecer və sahibkarların yetişdirilməsi, tələbə və gənclərin biznesə cəlb edilməsidir. Layihənin əsas hədəfi tələbə startapçılara bizneslərinin qurulmasında dəstək göstərmək və innovativ iqtisadiyyatın inkişafina töhfə verməkdən ibarətdir.

Heydər Əliyev Mərkəzi və Təhsil Nazirliyi tərəfindən ali təhsil müəssisələrinin tələbələri arasında "Heydər Əliyev və Azərbaycan tarixi" adlı ümumrespublika bilik yarışı keçirilib. Layihə ümummilli lider Heydər Əliyevin həyat və fəaliyyətinin dərindən öyrənilməsi, ulu öndərin irsinin təbliği məqsədi daşıyır. Yarışda ölkənin ali təhsil müəssisələrində bakalavriat və magistratura səviyyələri üzrə əyani təhsil alan tələbələrdən ibarət komandalar iştirak edib.

2014-2015-ci tədris ilində azərbaycanlı gənclərə "2007-2015-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə Dövlət Proqramı" çərçivəsində dünyanın 33 ölkəsinin 544 ali təhsil müəssisəsində təhsil almaq məqsədilə müraciət etmək imkanı verilib. Dövlət proqramı çərçivəsində namizədlərlə tam şəffaf şəkildə təhsil alacaqları dildə ali təhsil müəssisələrinin, nazirliklərin, qeyri-hökumət təşkilatlarının əməkdaşlarından ibarət tərkibdə komissiyalar tərəfindən müsahibələr aparılıb və obyektiv seçim edilib. Dövlət proqramına 2014-2015-ci tədris ili üçün namizədlərin seçimi prosesində şəffaflığın təmin olunması məqsədilə müsahibə zamanı ilk dəfə audio-videoçəkiliş aparılıb. Aparılmış seçim nəticəsində 573 tələbənin adı dünyanın nüfuzlu ali məktəblərində təhsil almaq hüququ qazanmış proqram təqaüdçüləri siyahısına daxil edilib.

Dövlət proqramının əsas məqsədi qısa perspektivdə ölkəmizin yüksək rəqabət qabiliyyətli kadrlara olan tələbatını ödəmək olduğundan seçimlər zamanı bakalavriatdan sonrakı təhsil səviyyələrinə üstünlük verilib. Belə ki, seçimlər nəticəsində 310 nəfər magistratura, 44 nəfər doktorantura, 65 nəfər rezidentura təhsili almaq hüququ qazanıb. Ölkəmiz üçün prioritet müəyyən olunan mühəndislik, tibb, informasiya texnologiyaları sahəsində yüksək göstəricilərə malik, beynəlxalq olimpiada iştirakçıları, müsahibə zamanı yüksək bilik, xarici dil hazırlığı nümayiş etdirmiş 154 tələbə isə baza ali tibb və bakalavriat səviyyələrində təhsil almaq imkanı əldə edib.

Sevindirici haldır ki, ilk dəfə olaraq 9 nəfər kənd təsərrüfatı, 14 nəfər isə təhsilin təşkili və idarəolunması kimi vacib sahələr üzrə təhsil almaq hüququ qazanıb. Tələbələr əsasən Türkiyə, Böyük Britaniya və digər inkişaf etmiş ölkələrdə təhsil almağa üstünlük veriblər. Bununla yanaşı, Kanadada 29, Rusiyada 25, Avstraliyada 19, ABŞ-da 16 nəfər tələbə təhsilini davam etdirmək imkanı qazanıb. Dövlət proqramı çərçivəsində indiyədək 3000-dən çox gənc dünyanın aparıcı ali təhsil müəssisələrində təhsil almaq imkanı əldə edib. Onu da qeyd edək ki, Təhsil Nazirliyi tərəfindən 2015-2020-ci illərdə Azərbaycan gənclərinin xarici ölkələrdə təhsili üzrə yeni dövlət proqramı hazırlanır.

2015-2016-cı tədris ilində isə azərbaycanlı gənclər dövlət proqramı çərçivəsində dünyanın 33 ölkəsinin 419 ali təhsil müəssisəsində müvafiq prioritet ixtisas istiqamətləri üzrə təhsil almaq məqsədilə müraciət edə biləcəklər.

Eyni zamanda, bu il prioritet ixtisas istiqamətlərinin əhatəliyinin genişlənməsi, yüksək texnologiyalar, sənaye, ekologiya kimi yeni ixtisas istiqamətlərinin əlavə olunması tələbələrə ölkənin inkişaf prioritetlərinə uyğun olaraq geniş seçim imkanı yaradacaqdır. Prioritet ixtisas istiqamətləri I və II dərəcəli olmaqla müəyyən edilib. Bu il keçiriləcək müsabiqədə əsas üstünlük I dərəcəli ixtisas istiqamətlərinə veriləcəkdir.

Azərbaycan Respublikası Prezidentinin "Dövlət orqanlarında elektron xidmətlərin göstərilməsi haqqında" fərmanından və "Vətəndaşların müraciətlərinə baxılması qaydası haqqında" Azərbaycan Respublikasının Qanunundan irəli gələn vəzifələrin səmərəliliyinin artırılması məqsədilə Təhsil Nazirliyi tərəfindən müvafiq tədbirlər həyata keçirilib. Belə ki, ötən il Təhsil Nazirliyinin yeni Telefon Məlumat Mərkəzi və Vətəndaşların Qəbulu Mərkəzi istifadəyə verilib. Mərkəzlərə xüsusi təlim keçmiş əməkdaşlar cəlb olunub. Vətəndaşların Qəbulu Mərkəzində ötən il 58370 vətəndaşa xidmət göstərilib.

Təhsil Nazirliyi tərəfindən göstərilən elektron xidmətlərin sayı və keyfiyyəti artırılıb. Hazırda 6 interaktiv və 20-dən artıq informativ elektron xidmət göstərilir.

Təhsil Nazirliyinin KİV və QHT-lərlə daha səmərəli münasibətlərin qurulması üçün həyata keçirilən siyasət ictimaiyyətlə əlaqələrinin daha açıq, şəffaf və operativ qurulmasına xidmət edir. Bu məqsədlə "dəyirmi masa"lar, seminar və brifinqlər keçirilib, jurnalistlərin və QHT təmsilçilərinin təhsil müəssisələrinə səfərləri təşkil olunub. Həmçinin təhsil və müdafiə nazirliklərinin birgə təşkilatçılığı ilə cəbhəyanı bölgəyə - Ağdam, Tərtər, Ağcabədi, Qazax və Tovuz rayonlarına səfərlər çərçivəsində media nümayəndələri ümumtəhsil müəssisələrində olub, gənclərin çağırışaqədərki hazırlığı və digər dərslərdə iştirak ediblər. Eləcə də media nümayəndələri və şagirdlər hərbi hissələrdə əsgərlərin döyüş hazırlığı səviyyəsini nümayiş etdirən çıxışlarını izləyiblər.

Azərbaycan təhsilinin inkişafı istiqamətində 2014-cü ildə həyata keçirilən işlər bir məqsədə - təhsilin müasir tələblər səviyyəsinə yüksəldilməsi və keyfiyyətinin artırılması ilə bağlı qarşıda duran vəzifələrin uğurlu həllinə xidmət edir.

**Mikayıl CABBAROV,**
**Azərbaycan Respublikasının**
**Təhsil naziri**

*"Azərbaycan" qəzeti, 1 mart 2015-ci il*

# ADPU-da "Çanaqqala zəfəri və şəhidlərimizi anma" adlı tədbir keçirilib

(Əvvəli 2-ci səhifədə)

çətin və mürəkkəb dövrlərində öz gücünü, iradəsini ortaya qoyaraq nələr edə biləcəyini bütün dünyaya göstərmişdir. Bu savaş həm də Türk Qurtuluş Döyüşünə böyük təsir göstərmişdir. Məhz buna görə Türkiyə Respublikası qurulduqdan sonra ingilis və fransız donanmalarının geri çəkilməyə məcbur edildiyi 18 mart tarixi Çanaqqala Şəhidlərini Xatırlama Günü olaraq elan edilmişdir. Düşmən tərəfi olan Antanta birliyi üçünsə bu döyüş hərbi bacarıqsızlıq və fəlakət simvolu olaraq qəbul edilmişdir.

Yeri gəlmişkən, deyə bilərik ki, böyük Atatürkün öz əsgərlərinə «Mən sizə vuruşmağı əmr etmirəm, ölməyi əmr edirəm!» çağırışı Çanaqqala savaşının gedişinə və nəticəsinə böyük təsir göstərmişdir. Bu gün bütün Türk dünyasının parlaq hərbi-siyasi istedadından, məharətindən böyük qürur və fəxr duyduğu Mustafa Kamal Atatürk bu döyüşdə öz üzərinə düşən hərbi vəzifələri layiqincə yerinə yetirmşdir. Mustafa Kamal Atatürk elə döyüşlərin ilk günlərindən öz parlaq hərbi istedadını üzə çıxarmış və «Anafartalar qəhrəmanı» adı ilə də tanınmış, məşhurlaşmışdır. Bu fakt həm də Mustafa Kamal Atatürkün Türk xalqının milli lideri kimi ortaya çıxmasında müstəsna rol oynamışdır.

Tədbirdə çıxış edən Türkiyənin Azərbaycandakı Təhsil müşavirinin müavini İdris Göbütoğlu tədbirin keçirilməsinə görə ADPU-nun rəhbərliyinə öz təşəkkürünü bildirib. O, Çanaqqala savaşının 99-cu ildönümündən başlayaraq müxtəlif tədbirlərin keçirildiyini və bu tədbirlər çərçivəsində azərbaycanlı və türkiyəli gənclərin Çanaqqalanı ziyarət etdiklərini mərasim iştirakçıların diqqətinə çatdırıb. İdris Göbütoğlu eyni zamanda tələbə-gənclərə həmişə Vətən, xalq, dövlət, bayraq kimi yüksək dəyərlər uğrunda mübariz olmağı tövsiyə edib.

Tədbirdə "Çanaqqalada yaşanmış həyat hekayəsi" və "Çanaqqala tarixi" mövzularında məruzələr dinlənilib, Azərbaycan və Türkiyə qardaşlığının tarixi haqqında Nəriman Nərimanovun və Mustafa Kamal Atatürkün məktubları səsləndirilib, Türkiyəli Tələbələrin İdarə Heyətinin və Tələbə Gənclər Təşkilatının Pedaqoji Universitetin professor-müəllimlərinin maraqlı və dəyərli fikirləri əsasında hazırladıqları videogörüntülər təqdim edilib.

Tələbə gənclər "Bayraq", "Dur,yolçu!", "Bu Vətən kimin?", "Çanaqqala zəfəri" şeirlərini söyləyiblər. Tədbir "Çanaqqala türküsü" türk xalq mahnısının səsləndirilməsi ilə yekunlaşıb.

**Mətbuat və informasiya şöbəsi**

# "Ulu öndər Heydər Əliyev və milli-mənəvi dəyərlərimiz"

## ADPU-da bu mövzuda tədbir keçirilib

**Mart ayının 12-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Böyük zalında Tarix fakültəsinin və Təhsil Nazirliyinin Bakı Şəhəri üzrə Təhsil İdarəsinin Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin birgə təşkilatçılığı ilə "Ulu öndər Heydər Əliyev və milli-mənəvi dəyərlərimiz" mövzusunda tədbir keçirilib. Tədbirdə ADPU-nun rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi, Səbail Rayon İcra Hakimiyyətinin əməkdaşları və Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbinin rəhbərliyi, şagirdləri iştirak ediblər.**

Tədbir iştirakçıları əvvəlcə ulu öndər Heydər Əliyevin ADPU-dakı abidəsi önünə gül dəstələri qoyublar, sonra tədbir universitetin Böyük zalında davam etdirilib. Tədbirdə ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilib.Ulu ondər Heydər Əliyevin xatirəsi bir dəqiqəlik sükütla yad edilib.

ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev tədbiri giriş sözü ilə açaraq bildirib ki, Təhsil naziri cənab Mikayıl Cabbbarov bu il fevral ayının 20-də xalqımızın ümummilli lideri Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü ilə əlaqədar təhsil müəssisələrində keçiriləcək tədbirlər haqqında 203 nömrəli əmr imzalamışdır. Həmin əmrlə ulu öndər Heydər Əliyevin anadan olmasının 92-ci ildönümü ilə əlaqədar Təhsil Nazirliyinin Fəaliyyət Planı təsdiq edilmişdir. Fəaliyyət Planında gerçəkləşməsi nəzərdə tutulan əsas tədbirlərdən biri də ölkənin ali təhsil müəssisələrində onların peşə-ixtisas istiqamətlərinə uyğun olaraq, ümummilli lider Heydər Əliyevin dövlət quruculuğunun, elm, təhsil və mədəniyyətin, həmçinin iqtisadiyyatın, idmanın inkişafındakı roluna həsr olunmuş elmi və elmi-praktik konfransların keçirilməsidir. Bizim bu gün Səbail Rayon İcra Hakimiyyəti və Məmməd Rahim adına 7 nömrəli tam orta məktəblə birlikdə "Ulu öndər Heydər Əliyev və milli-mənəvi dəyərlərimiz" mövzusunda keçirdiyimiz tədbir də yuxarıda qeyd etdiyim əmrin və Fəaliyyət Planının icrasına uyğun olaraq keçirilən silsilə tədbirlərdən biridir.

Prorektor R.Baxşəliyev qeyd edib ki, ümummilli lider Heydər Əliyev həmişə həyatımızın bütün sahələri ilə yanaşı, xalqımızın ictimai-siyasi və mədəni-mənəvi həyatının yüksəlişinə də xüsusi diqqət yetirirdi. Ulu öndər Heydər Əliyev ötən əsrin 60-cı illərinin sonları, 70-ci illərinin əvvəllərində xalqımızın ümumi yüksəlişi və inkişafı fonunda Azərbaycan tarixinin problemlərinin yenidən işlənilməsinə nail oldu. Xalqımızın böyük oğlu, məşhur yazıçı, tanınmış maarifçi, görkəmli ictimai-siyasi xadim Nəriman Nərimanovun 100 illik yubileyinin təntənəli qeyd edilməsi, Bakıda və Ulyanovskdə əzəmətli heykəllərinin qoyulması, eyni zamanda Bakıda və Tbilisidə ev-muzeylərinin açılması, həmçinin böyük mütəfəkkir, görkəmli şair və dramaturq Hüseyn Cavidin nəşinin Azərbaycana gətirilərək Naxçıvanda dəfni, məqbərəsinin inşa edilməsi, xalqımızın böyük söz ustadları Rəsul Rzanın, Bəxtiyar Vahabzadənin, Xəlil Rzanın, Məmməd Arazın və digər qələm sahiblərinin, eləcə də görkəmli elm xadimlərinin öz vətənpərvər milli baxışlarına görə haqsız təzyiq və təqiblərdən qorunması da Heydər Əliyevin xalqımız, millətimiz qarşısında göstərdiyi böyük tarixi xidmətləri sırasında mühüm yer tutur. "İncəsənət mənim bütün həyatımdan keçmişdir" - deyən Ulu Öndər həm də sənət adamlarının, yaradıcı insanların böyük qayğıkeşi və hamisi idi.

Ulu öndər Heydər Əliyev sözün həqiqi mənasında milli təəssübkeşimiz idi. Humanist, ədalətli, müdrik, sadə, qayğıkeş, xeyirxah, eyni zamanda iradəli, prinsipial, cəsarətli və qətiyyətli bir insan olan Heydər Əliyev milli-mənəvi dəyərlərimizə dərindən bağlı idi. Ümummilli Liderin ən çox diqqət yetirdiyi məqamlardan biri də azərbaycançılıq ideyasının gücləndirilməsi, dünya azərbaycanlılarının bu amal ətrafında birləşdirilməsi olmuşdur. Tarixin amansız və sərt sınaqları dövründə dünyanın ayrı-ayrı ölkələrinə səpələnərək qürbətdə yaşamaq məcburiyyətində qalmış soydaşlarımızın taleyi Heydər Əliyevi daim narahat edirdi. Onun hələ Naxçıvan Ali Məclisinin Sədri olarkən 1991-ci ildə 31 Dekabrı Dünya Azərbaycanlılarının Həmrəyliyi Günü elan etməsi dünyanın 70 ölkəsində yaşayan 50 milyondan artıq azərbaycanlının ürəyində Vətən sevgisinin güclənməsinə təkan vermişdir. Bu birliyin siyasi əsaslarının yaradılmasına, təşkilatlanma prosesinin sürətlənməsinə xidmət edən, 2001-ci ildən başlayaraq dünya azərbaycanlılarının qurultaylarının keçirilməsi millətimiz üçün tarixi hadisəyə çevrilmişdir. Böyük qürur hissi ilə ən mötəbər kürsülərdən «Hər bir insanın milli mənsubiyyəti onun qürur mənbəyidir. Mən həmişə fəxr etmişəm, bu gün də fəxr edirəm ki, mən azərbaycanlıyam!» deyən Heydər Əliyev sözün gerçək mənasında ən böyük Azərbaycanlı idi. Dünya Azərbaycanlılarının I Qurultayında ulu öndər Heydər Əliyev Azərbaycançılığı belə səciyyələndirmişdir: «Azərbaycançılıq öz mili mənsubiyyətini qoruyub-saxlamaq, milli-mənəvi dəyərlərini qoruyub-saxlamaq, eyni zamanda onların ümumbəşəri dəyərlərlə sintezindən, inteqrasiyasından bəhrələnmək və hər insanın inkişafının təmin olunması deməkdir». Heydər Əliyev eyni zamanda Azərbaycan dilinin, mədəniyyətinin, milli dəyərlərin, adət-ənənələrinin qorunması və yaşaması üçün siyasi, iqtisadi və hüquqi baza yaradılmasını daim diqqət mərkəzində saxlamışdır.



Milli düşüncənin inkişafında dilin əvəzolunmaz vasitə olduğunu yaxşı bilən Heydər Əliyev Azərbaycan dilinin dövlət dili statusu almasına daim səy göstərmişdir. Elə bu səbəbdən də hələ Sovet dövründə respublikamıza rəhbərlik edərkən müxtəlif maneələri dəf etməli olan Ulu Öndər Azərbaycan dilinin dövlət dili kimi Konstitusiyada təsbit olunmasında israrlı idi. 1978-ci ildə Ulu Öndərin qətiyyət və fədakarlığı sayəsində Azərbaycan dili dövlət dili kimi Konstitusiyaya salınmışdı.



Ulu öndər Heydər Əliyev Azərbaycan dilinə olan böyük məhəbbətini, sonsuz ehtiramını müstəqil ölkəmizə rəhbərlik etdiyi dövrlərdə daha yüksək səviyyədə göstərmişdir. Ulu Öndər 18 iyun 2001-ci il tarixdə «Dövlət dilinin tətbiqi işinin təkmilləşdirilməsi haqqında» fərman, 4 iyul 2001-ci il tarixdə «Azərbaycan Respublikası Dövlət Dil Komissiyasının tərkibinin təsdiq edilməsi haqqında» sərəncam, 9 avqust 2001-ci il tarixdə «Azərbaycan əlifbası və Azərbaycan dili günü təsis edilməsi haqqında» sərəncam, 2 yanvar 2003-cü il tarixdə isə «Azərbaycan Respublikasında Dövlət dili haqqında» Azərbaycan Respublikası Qanununun tətbiq edilməsi barədə» fərman imzalamışdır.

Eyni zamanda ulu öndər Heydər Əliyev Azərbaycanda yenidən hakimiyyətə qayıtdıqdan sonra xalqımızın bir çox adət-ənənələri, bayramları yenidən bərpa edildi. Xalqımızın çox əziz milli bayramı olan Novruz bayramının qeyd edilməsi rəsmiləşdirildi. Novruz bayramının ölkəmizdə rəsmi qaydada keçirilməsi də Heydər Əliyevin adı və onun vətənpərvər, millətsevər fəaliyyəti ilə bağlıdır. Ulu öndər Heydər Əliyevin təşəbbüsü ilə 1997-ci ildən Novruz bayramı ölkəmizdə rəsmi qaydada qeyd edilməyə başlanılmışdır. Dahi öndər Heydər Əliyev paytaxtda Novruz bayramı münasibətilə keçirilən xalq şənliklərində iştirak edir, sadə vətəndaşların bayram əhval-ruhiyyəsini, sevincini bölüşürdü. Bu, Heydər Əliyevin Novruz bayramına olan diqqətinin, xüsusi münasibətinin təzahürü idi. Bununla yanaşı,müdrik rəhbərimiz Heydər Əliyevin böyük qayğı və diqqəti nəticəsində 2000-ci ildə "Kitabi-Dədə Qorqud"un 1300 illik yubileyinin UNESKO xətti ilə beynəlxalq miqyasda təntənəli qeyd edilməsi də Heydər Əliyevin milli-mənəvi dəyərlərimizə olan hörmət və ehtiramının növbəti parlaq təcəssümü idi.

Ulu öndər Heydər Əliyevin müdrik dövlətçilik kursunun, strateji inkişaf konsepsiyasının layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin milli-mənəvi dəyərlərimizə, o cümlədən Novruz bayramına olan qayğıkeş münasibəti bu gün eyni ənənəni yaşadır. Bu baxımdan, ölkə Prezidenti İlham Əliyevin xalqımızın mədəni sərvətlər xəzinəsində müstəsna yer tutan və əsrlərdən bəri milli-mənəvi varlığın ayrılmaz tərkib hissəsinə çevrilən "Kitabi-Dədə Qorqud"un alman dilində ilk tərcüməsi və nəşrinin 200 illiyinin qeyd edilməsi haqqında" bu il fevral ayının 20-də imzaladığı sərəncam da diqqəti xüsusi cəlb edir.

Prorektor R.Baxşəliyev çıxışına davam edərək bildirib ki, Azərbaycanın birinci xanımı, görkəmli ictimai-siyasi xadim, Heydər Əliyev Fondunun prezidenti, YAP-ın Sədr müavini, millət vəkili, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri Mehriban Əliyevanın təşəbbüsü, səyləri və bu istiqamətdə apardğı səmərəli əməli fəaliyyəti nəticəsində Novruz bayramı 2009-cu il sentyabr ayının 30-da BMT-nin ali mədəniyyət qurumu olan UNESKO-nun qeyri- maddi mədəni irs siyahısına daxil edilmişdir. 2010-cu il fevral ayının 23-də isə BMT Baş Məclisinin 64-cü sessiyasının qərarı ilə 21 mart rəsmi qaydada Beynəlxalq Novruz Günü elan edilmişdir. Yəni Novruz bayramı artıq 2010-cu ildən başlayaraq dünya səviyyəsində qeyd edilən bir təqvimə çevrilmişdir. Bununla yanaşı,xalqımızın ən qədim və məşhur sənət növlərindən biri olan xalçaçılıq sənəti Mehriban xanım Əliyevanın vətənpərvər fəaliyyəti sayəsində UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edilmişdir. Bunlardan sonra xalqımızın qədim musiqi aləti olan tar UNESKO-nun qeyri-maddi mədəni irs siyahısına daxil edildi, bir müddət öncə isə milli rəqslərimiz və çövkən oyunu da bu siyahıya daxil edildi.

Tədbirdə Məmməd Rahim adına 7 nömrəli tam orta məktəbin direktoru Könül Həsənova çıxış edərək ulu öndər Heydər Əliyevin hər zaman milli-mənəvi dəyərlərimizə yüksək qayğı və diqqət göstərdiyini bildirmiş, bu qayğı və diqqəti hazırda dövlət başçımız cənab İlham Əliyevin uğurla davam etdirdiyini vurğulamışdır. .

Tədbirdə ulu öndər Heydər Əliyev haqqında slayd nümayiş etdirilib, məktəblilər şeirlər söyləyib, "Yallı" rəqsini ifa edib, Dədə Qorqudla bağlı səhnəcik oynayıblar. Novruz bayramının personajları olan Kosa,Keçəl və Bahar qızın ifa etdikləri səhnəcik, ADPU-nun tələbə-gənclərinin oxuduqları mahnılar, "Cahan" qrupunun və muğam ustalarının çıxışları tədbir iştirakçıları tərəfindən məmnunluqla qarşılanıb.

Tədbir "Canım Azərbaycan" mahnısı ilə yekunlaşıb.

**Gülnar SÜLEYMANOVA,**
**Könül NƏZƏROVA**

# Tarix fakültəsində ingilis dilində növbəti açıq dərs

Mart ayının 13-də Tarix fakültəsinin I kursunun 104-cü, 101-ci, 102-ci, 103-cü və 106-cı qrup tələbələri ingilis dilində növbəti açıq dərs keçiriblər. Açıq dərsdə Tarix fakültəsinin dekanı, professor Oqtay Sultanov, dekan müavini, baş müəllim Habil Həsənov, Xarici dillər kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva, həmin kafedranın baş müəllimi Nazilə Rəhimova, müəllimi Arzu Hüseynova, Tarix fakültəsinin I kurs tələbələrinin tyutoru Nabat Talıbzadə iştirak ediblər. Xarici dillər kafedrasının baş müəllim Sevda Ağayevanın keçirdiyi açıq dərs Azərbaycanın orta əsrlər dövrünə həsr olunub.

Tədbirdə ilk olaraq Azərbaycanın Dövlət Himni səsləndirilib.

Açıq dərsdə keçirilən mövzu Azərbaycan ərazisində orta əsrlərdə mövcud olan dövlətlər, onların sərkərdələri, dövlət başçıları haqqında olub. Öncə



aparıcı, 104-cü qrup tələbəsi Nərmin Heybətova Azərbaycanın orta əsrlər tarixi Ərəb Xilafətinin tənəzzülü, Səlcuq yürüşləri, monqol yürüşləri, Hülaki dövlətinin zəifləməsi, Əmir Teymurun hücumları barədə ümumi məlumat verib. Sonra tələbələr Şirvanşahlar, Sacilər, Salarilər, Rəvvadilər, Şəddadilər, Eldənizlər, Qaraqoyunlu, Ağqoyunlu, Səfəvilər dövlətləri barədə dolğun məlumat veriblər. Açıq dərsdə eləcə də Eldənizlər sülaləsinin banisi Atabəy Şəmsəddin Eldəniz, Ağqoyunlu dövlətinin məşhur hökmdarı Uzun Həsən, Şərqdə ilk diplomat qadın - Sara Xatun, Səfəvi dövlətinin yaradıcısı Şah İsmayıl Səfəvi barədə iştirakçılara ingilis dilində geniş məlumat verilib. Bütün bu məlumatları 104-cü qrup tələbələri Şəbnəm



Veysəlzadə, Nübar Rüstəmzadə, Şəlalə Qurbanova, Nərmin Heybətova, Könül Kərimli, Fatimə Əkbərli, Könül Məmmədova, Günel Seyidova, Mülayim Babayeva, Şəbnəm İsalı, Bəhram Əsgərli, Zərifə Şükürlü, 101-ci qrup tələbələri Rəvanə Məmmədova, Fidan Hüseynli, Hava Qasımova, Ruslan Ələsgərov, Sərxan Tağıyev, 102-ci qrup tələbəsi Aliyə Orucova, 103-cü qrup tələbəsi Günel Qocayeva, 106-cı qrup tələbəsi Əminə Paşayeva sinxron şəkildə videoçarxla auditoriyaya çatdırıblar. 103-cü qrup tələbəsi Hatəm Qəhrəmanov və 104-cü qrup tələbəsi Fidan Tağıyeva videoçarxları təqdim ediblər.

104-cü qrup tələbələri Nərmin Heybətova, Könül Məmmədova, Nübar Rüstəmzadə və 103-cü qrup tələbəsi Günel Qocayeva xalqımızın gözəl milli bayramı olan Novruz bayramı, onun atributları haqqında, eləcə də digər bayramlar barədə geniş məlumat veriblər. Daha sonra tələbələr ingilis dilində Xalq şairi Səməd Vurğunun məşhur "Azərbaycan" şeirini söyləyiblər.

Qeyd edək ki, açıq dərsdə Vətənimizə, həmçinin bayrama aid mahnılar səslənib, videokliplər göstərilib. Bütün bu məlumatlar videoçarxla nümayiş etdirilib.

Açıq dərsin sonunda Xarici dillər kafedrasının müdiri, dosent G. Alıyeva, həmin kafedranın baş müəllimi N.Rəhimova, müəllimi A.Hüseynova çıxış edərək baş müəllim Sevda Ağayevaya və tələbələrə öz təşəkkürlərini bildiriblər. Xarici dillər kafedrasının müdiri, dosent G.Alıyeva tələbərin açıq dərs zamanı sərbəst olmalarını alqışlayıb, belə açıq dərslərin artıq 4 il davam etdiyini bildirib və budəfəki açıq dərsin daha mükəmməl, daha maraqlı olduğunu qeyd edib, onlara gələcək açıq dərslərdə və bütövlükdə təhsildə uğurlar arzulayıb.

**Sevda AĞAYEVA,**
**Xarici dillər kafedrasının baş müəllimi**

# 8 Mart - Beynəlxalq Qadınlar Günü münasibətilə konsert

İlk olaraq onu qeyd edək ki,8 Mart - Beynəlxalq Qadınlar Günü artıq 100 ildən çoxdur ki, bütün dünya ictimaiyyəti tərəfindən təntənəli şəkildə qeyd edilir. Bu əlamətdar gün ilk dəfə 1910-cu ildə alman inqilabçı qadını Klara Setkinin təşəbbüsü ilə keçirilib. Qadınlar bayramı dünyada ilk dəfə 1911-ci ildə ABŞ-da və Avropanın bir sıra ölkələrində qeyd olunub. Azərbaycanda bu bayram 1917-ci ildən qeyd olunur. Bu bayram 1966-cı ildən başlayaraq keçmiş SSRİ-də dövlət səviyyəsində qeyd olunurdu.



Qadının tarixən cəmiyyətdə rolu böyük olmuşdur və bu rol müasir dövrümüzdə də böyük əhəmiyyət kəsb edir. Qadın cəmiyyətdə insan nəslinin daşıyıcısı olmaqla yanaşı, həm də ictimai-siyasi həyatda mühüm rol oynayır. Fəxrlə deyə bilərik ki, Azərbaycan qadını həmişə bütün dünyada yüksək mənəvi-əxlaqi keyfiyyətləri ilə tanınmış və məşhur olmuşdur. Elə xalqımızı dünyada üzüağ edən yüksək mənəvi xüsusiyyətlərdən biri də budur. Azərbaycan qadını həm də öz müdrikliyi ilə məşhurdur.




Qürur hissi ilə deyə bilərik ki, müstəqil Azərbaycanda da qadınlarımızın rolu cəmiyyətdə çox yüksəkdir. Əsası ulu öndərimiz Heydər Əliyev tərəfindən qoyulmuş müdrik idarəçilik və dövlətçilik kursunu onun ideyalarının ən layiqli davamçısı, Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyevin çox uğurla davam etdirməsi qadınlarımızın müstəqil ölkəmizin ictimai-siyasi və elmi-mədəni həyatında fəal iştirak etmələri üçün əlverişli şərait yaratmışdır. Ölkəmizdə qadınların hüquqlarının yüksək səviyyədə qorunması üçün müvafiq qanunların qəbuluna böyük əhəmiyyət verilir. Bu gün qadınlarımız onlara dövlət səviyyəsində yaradılmış şəraitdən lazımınca faydalanaraq, bütün sahələrdə - elm və təhsil müəssisələrində, parlamentdə millət vəkili kimi qanun yaradıcılığında, səhiyyə, mədəniyyət incəsənət sahəsində, dövlət idarəçiliyinin müxtəlif sahələrində və eləcə də özəl sahədə uğurla fəaliyyət göstərirlər. Hazırda bütün qadınlarımıza ən layiqli nümunə Azərbaycanın birinci xanımı, Heydər Əliyev Fondunun prezidenti, UNESKO-nun və İSESKO-nun xoşməramlı səfiri, Yeni Azərbaycan Partiyasının Sədr müavini, Milli Məclisin deputatı Mehriban Əliyevadır.

Qeyd edək ki, Mehriban xanım Əliyeva, həqiqətən də, Azərbaycan elminin, təhsilinin, mədəniyyətinin, səhiyyəsinin hərtərəfli inkişafı üçün çox səmərəli fəaliyyət göstərir. Həmçinin milli-mənəvi dəyərlərimizin qorunub saxlanılması, xüsusən də, muğam sənətinin daha da inkişaf etdirilməsi və dünyada yüksək səviyyədə təbliği Mehriban xanım Əliyevanın hər bir zaman böyük diqqət yetirdiyi sahələrdir. Elə bütün bu müsbət xüsusiyyətlərinə görə Mehriban xanım Əliyeva xalqımız tərəfindən ziyalı, vətənpərvər və ləyaqətli bir Azərbaycan qadını, xeyirxah ictimai-siyasi xadim kimi sevilir və qəbul edilir. Yeri gəlmişkən, Heydər Əliyev Fondunun vitse-prezidenti Leyla xanım Əliyevanın da Azərbaycan həqiqətlərinin dünyaya çatdırılması istiqamətindəki səmərəli fəaliyyəti xalqımızda böyük rəğbət hissi yaradır. Mart ayının 6 -da Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Pedaqoji fakültəsinin təşkilatçılığı ilə universitetin Böyük zalında 8 Mart - Beynəlxalq Qadınlar Günü münasibətilə keçirilən konsert proqramı da qadınlara olan hörmət və ehtiramı əks etdirirdi.

ADPU-nun Tədris işləri üzrə prorektoru, professor Malik Cəbrayılov konsert proqramından öncə çıxış edərək universitetin qadın əməkdaşlarını bayram münasibətilə təbrik edib, ən xoş, ən səmimi arzularını bildirib, onlara uğurlar arzulayıb. Konsert zamanı monitorda ulu öndər Heydər Əliyevin həyat və fəaliyyətinin müxtəlif məqamları əks olunub. Konsert Sevil Əliyevanın "Ana" musiqisinin səslənməsi ilə başlayıb, sonra sözləri şair Oqtay Rzanın, bəstəkarı isə Elnarə Dadaşova olan universitetin himni musiqi şöbəsinin xorunun ifasında səsləndirilib. Daha sonra Musiqi alətləri fənlərinin tədrisi metodikası kafedrasının müdiri, professor Minarə Dadaşova, professor Zemfira Abdullayeva, dosent Aida Hüseynova və həmin kafedranın baş müəllimləri Lalə Məlikova, Camal Osmanov, Gülarə Aslanova, konsertmeyster Elmira Həsənova, həmçinin Musiqi fənləri və onun tədrisi metodikası kafedrasının baş müəllimi Nərmin Kamilova tələbə-gənclərlə birlikdə Azərbaycan və xarici ölkə bəstəkarlarının müxtəlif musiqi əsərlərini ifa ediblər. Müəllim və tələbələrimizin musiqi çələngi universitet kollektivinin böyük sevincinə səbəb olub.

**Könül NƏRİMANQIZI**

# 31 Mart Soyqırımı - həddi bilinməyən erməni vəhşiliyi

## *ADPU-da 31 Mart - Azərbaycanlıların Soyqırımı Günü ilə əlaqədar anım mərasimi keçirilib*

Mart ayının 31-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) "Heydər Əliyev məktəbinin lektoriyası" nda 31 Mart-Azərbaycanlıların Soyqırımı Günü ilə əlaqədar anım mərasimi keçirilib. Anım mərasimində ilk olaraq ermənilərin öz havadarlarının köməyi ilə 1918-ci ilin mart ayının 31-də Azərbaycanda həyata keçirdikləri soyqırımı nəticəsində həlak olmuş soydaşlarımızın, eləcə də bütün şəhidlərimizin xatirələri bir dəqiqəlik sükutla yad edilib.




ADPU-nun Tərbiyə işləri üzrə prorektoru, professor Rafiq Baxşəliyev anım mərasimini giriş sözü ilə açaraq bildirib ki,ermənilərin öz himayədarlarının köməyi ilə xalqımıza qarşı 1918-ci ilin martın 31-də törətdikləri soyqırımından 97 il keçir. Əslində, ermənilərin xalqımıza qarşı həyata keçirdikləri genosid siyasətinin kökü tarixin dərinliklərinə gedib çıxır. Azərbaycan Respublikasının Prezidenti möhtərəm cənab İlham Əliyev bu barədə belə demişdir: «Erməni millətçiləri tərəfindən xalqımıza qarşı həyata keçirilən soyqırımı və təcavüz siyasətinin iki yüz ilə yaxın bir tarixi vardır. Bu mənfur siyasətin məqsədi azərbaycanlıları tarixi torpaqlarından qovmaq, bu ərazilərdə erməni tarixçilərinin və ideoloqlarının uydurduğu «Böyük Ermənistan» dövləti yaratmaq idi. Xalqımızın tarixi kobud şəkildə saxtalaşdırılmış, maddi və mədəniyyət abidələrimiz, toponimlərimiz erməni tarixçiləri və «ideoloqlarının» təcavüzünə məruz qalmışdır».

Anım mərasimində "31 Mart-Azərbaycanlıların Soyqırımı Günü" mövzusunda məruzə ilə çıxış edən Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının professoru Mübariz Əmirov bildirib ki, ermənilərin xalqımıza qarşı törətdikləri çoxsaylı vəhşiliklərin arasında 1918-ci ilin mart hadisələri xüsusi amansızlığı və qəddarlığı ilə seçilir. 1918-ci ilin mart hadisələri zamanı azərbaycanlıların ermənilər tərəfindən kütləvi surətdə qırılması halı baş vermişdir. Belə ki, ermənilər yeni təqvimlə 1918-ci il martın 31-dən aprelin 2-nə (köhnə təqvimlə isə martın 18-dən 21-dək) qədər Bakıda 17000, Şamaxıda isə 8000-dən çox dinc azərbaycanlı sakini xüsusi qəddarlıqla qətlə yetirmişlər. Qətlə yetirilənlərdən 2500 nəfərdən çoxu qadın, 200-ü isə uşaq olmuşdur. Bütövlükdə isə 1918-ci ilin mart hadisələri zamanı ermənilər 50 mindən çox azərbaycanlını öldürmüş, 10 mindən çox insanı isə öz yaşayış yerlərini qoyub qaçmağa məcbur etmişlər. Erməni vandalistləri eləcə də Qubada, Lənkəranda, Dağlıq Qarabağda, Qərbi Azərbaycanda, Naxçıvanda və Azərbaycanın digər bölgələrində 10 minlərlə dinc mülki vətəndaşı qətlə yetirmişlər. Ermənilərin bu vandalist aktının işlənib hazırlanmasının və həyata keçirilməsinin əsas ideoloqu daşnak xislətli Stepan Şaumyan olmuşdur. Ermənilər Azərbaycanda sözün həqiqi mənasında milli qırğın, əsl soyqırımı törətmişlər. Bu soyqırımında həm də rus-erməni bolşeviklərinin Bakı neftini ələ keçirmək istəyi mühüm rol oynamışdır.

Professor M.Əmirov qeyd edib ki, digər milli facilərimiz kimi, ermənilərin 1918-ci ilin martında xalqımıza qarşı törətdikləri soyqırımına da yalnız ümummilli liderimiz Heydər Əliyevin təşəbbüsü ilə dolğun və hərtərəfli siyasi-hüquqi qiymət verilmişdir. Ulu öndər Heydər Əliyevin 1998-ci il martın 26-da imzaladığı 690 saylı fərmanla 31 Mart dövlət səviyyəsində Azərbaycanlıların Soyqırımı Günü elan edilmişdir. Həmin fərmanla 31 Mart milli faciə günü kimi təqvimimizə daxil olmuşdur.

Professor M.Əmirov xüsusi vurğulayıb ki, biz həmişə hər yerdə ermənilərin vandalist əməllərini bütün çılpaqlıqları ilə açıb göstərməli, dünya ictimaiyyətinə və beynəlxalq təşkilatlara bu barədə obyektiv məlumatların çatdırılması üçün bütün imkanlarımızdan istifadə etməliyik. Eyni zamanda müstəqil Azərbaycan dövlətinin günü-gündən artan siyasi nüfuzu, iqtisadi və hərbi qüdrəti bizə belə deməyə imkan verir ki, Azərbaycan öz ərazi bütövlüyünü bərpa etməyə tam qadirdir və bu yaxın gələcəkdə reallaşacaqdır.

Ümumi tarix kafedrasının müdiri, AMEA-nın müxbir üzvü, professor Vəli Əliyev, Türk və Şərqi Avropa xalqları tarixi və tarixin tədrisi metodikası kafedrasının müəllimi Taleh Cəfərov çıxış edərək konkret elmi-tarixi faktlar əsasında ermənilərin tarix boyu xalqımıza qarşı törətdikləri cinayətləri, soyqırımları həddi bilinməyən vəhşilik kimi səciyyələndirmiş, tələbə-gəncləri vətənpərvər olmağa, düşmənlə bütün sahələrdə layiqincə mübarizə aparmağı tövsiyə ediblər. Onlar eyni zamanda tədbir iştirakçıları ilə ermənilərin xalqımıza qarşı törətdikləri bütün soyqırımları, o cümlədən 31 Mart Soyqırımı, eləcə də Xocalı soyqırımı ilə bağlı məlumatların dünya ictimaiyyətinə çatdırılması üçün öz fikir və təkliflərini bölüşüblər.

**"Gənc müəllim"**

# "Ulduz" jurnalının baş redaktoru Qulu Ağsəs ilə görüş keçirilib

Mart ayının 3-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Filologiya fakültəsinin təşkilatçılığı ilə universitetin kiçik zalında istedadlı və tanınmış şair, yazıçı-publisist, 1998 və 2007-ci illərin Prezident təqaüdçüsü, Azərbaycan Yazıçılar Birliyinin nəşri olan "Ulduz" jurnalının baş redaktoru, Yazıçılar Birliyinin İdarə Heyətinin üzvü Qulu Ağsəs ilə görüş keçirilib. Tədbirdə Filologiya fakültəsinin rəhbərliyi, professor-müəllim heyəti və tələbə-gəncləri iştirak ediblər.

Görüşü giriş sözü ilə açan Filologiya fakültəsinin dekanı, professor Buludxan Xəlilov tədbir iştirakçılarını ADPU-nun rektoru, AMEA-nın müxbir üzvü, Əməkdar elm xadimi, professor Yusif Məmmədovun və eyni zamanda Filologiya fakültəsinin rəhbərliyi, professor-müəllim heyəti və tələbə kollektivi adından salamlayıb. Professor B.Xəlilov həmçinin şair Qulu Ağsəsə bu görüş üçün dəvəti qəbul etdiyinə görə təşəkkürünü bildirib. Professor B.Xəlilov bu görüşdə bədii ədəbiyyata xüsusi marağı olan tələbə-gənclərin iştirak etdiyini vurğulayıb. O, qeyd edib ki, gənclər cəmiyyətin aparıcı qüvvəsi olmaqla yanaşı, həm də özünə inanan və arzularını reallaşdırmağa çalışan fəal təbəqəsidir. Gənclik eyni zamanda müasirdir, yenilikçidir. Bədii ədəbiyyat isə gənclərin daxili mənəvi dünyasının, əxlaqi keyfiyyətlərinin formalaşmasında, onların dünyagörüşünün genişlənməsində və intellekt səviyyəsinin yüksəlməsində mühüm rol oynayır.



Professor B.Xəlilov öz maraqlı və məzmunlu giriş sözündə həm də "Ulduz" jurnalının yaranma tarixindən və keçdiyi inkişaf yolundan danışaraq bildirib ki, ədəbi-bədii, publisistik jurnal olan "Ulduz" jurnalı 1967-ci ildə fəaliyyətə başlayıb. Jurnalın ilk baş redaktoru Xalq şairi Cabir Novruz olub. Jurnala müxtəlif dövrlərdə xalqımızın Əhməd Cəmil, Akif Hüseynov, Ələkbər Salahzadə, Abbas Abdulla, Yusif Səmədoğlu, Elçin Hüseynbəyli kimi tanınmış qələm sahibləri rəhbərlik edib. "Ulduz" jurnalı bütün dövrlərdə öz sərbəstliyini, müstəqlliyini qoruyub saxlaya bilib. Jurnal bu gün də istedadlı, yaradıcı gənclərin düzgün istiqamətlənməsində mühüm rol oynayır və onlara dəstək verir. "Ulduz" gəncliyin jurnalıdır. Eyni zamanda bu jurnalda müxtəlif yaradıcı nəsillərin nümayəndələrinin yazıları dərc olunur. Bu jurnal müxtəlif nəsillər arasında mənəvi körpü rolunu oynayır."Ulduz" jurnalı Azərbaycan ədəbi mühitinin inkişafına sözün həqiqi mənasında ciddi müsbət təsir göstərir və bu inkişafa öz layiqli töhfələrini verir. Qeyd edək ki, ötən əsrin 90-cı illərinin əvvəllərində Azərbaycanda yaranmış böhranlı və mürəkkəb ictimai-siyasi vəziyyət nəticəsində "Ulduz" jurnalı da öz fəaliyyətini dayandırmışdı. Xalqımızın ümummilli lideri Heydər Əliyev yenidən ölkəmizdə hakimiyyətə qayıtdıqdan sonra onun yüksək qayğı və diqqəti nəticəsində Azərbaycan Yazıçılar Birliyinin digər nəşrləri kimi bu jurnal da əvvəlki dövrlərdə olduğu kimi, dövlət hesabına çap olunmağa başladı. Jurnal bu gün də dövlət tərəfindən hərtərəfli dəstək alır. Hazırda "Ulduz" jurnalının baş redaktoru özünəməxsus yaradıcılıq üslubuna malik olan istedadlı şair, yazıçı-publisist, demokratik düşüncəli ziyalı, səmimi və xeyirxah insan olan Qulu Ağsəsdir. Qulu Ağsəs Azərbaycan ədəbi mühitində, poeziyasında, mətbuatında öz imzasını təsdiqləmiş yazarlardan biridir.



Canlı müzakirə şəraitində keçən görüşdə Filologiya fakültəsinin tələbələri - 205-ci qrup tələbəsi Nərmin Səlimova, 102-ci qrup tələbəsi Cəmilə Məhərrəmova, 308-ci qrup tələbəsi Könül Hüseynova, 206-cı qrup tələbəsi Zinarə Vəliyeva, 103-cü qrup tələbəsi Osman Cəfərli, 206-cı qrup tələbəsi Xəyalə Quliyeva, 206-cı qrup tələ-

(Davamı 8-ci səhifədə)

## TƏYYAR SALAMOĞLU - 55

# "SÖZ"ÜN LƏYAQƏTİNİ UCA TUTAN ALİM

Sözə zərgər dəqiqliyi ilə yanaşan mütəxəssis - ədəbiyyatşünas, tənqidçi haqqında söz demək çox çətin və məsuliyyətli işdir. Özü də çağdaş Azərbaycan ədəbi-nəzəri elminin kifayət qədər tanınmış, nüfuzlu söz sahiblərindən biri haqqında. Mərhum akademik Kamal Talıbzadə deyərdi: "Tənqiddən, tənqidçidən yazmaq bədii əsərdən, yazıçıdan yazmaq kimi deyil, daha mürəkkəb işdir." Ustadın həmin fikrinin mahiyyətini indi daha dərindən anlayıram, məhz fundamental tədqiqatlar müəllifi, filologiya üzrə elmlər doktoru, professor Təyyar Salamoğlu haqqında yazmaq istədiyim bir vaxtda.

Onun hələ öz ədəbi-elmi mövqeyini təsdiqləmək yolunda inamla, qətiyyətlə irəlilədiyi illərdə repressiya qurbanları və mühacirət ədəbiyyatı nümayəndələri barədə "Faciəli talelər" (1998) kitabı məni məqalə yazmağa sövq etmişdi. Azərbaycanın mübariz milli ədəbi şəxsiyyətləri, talesiz yazıçıları Səməd Mənsur, Əhməd Cavad, Umgülsüm Sadıqzadə, Almas İldırım haqqında portret-oçerklərdə gənc alimin öz tədqiqat obyektinə dərindən bələdliyi, düzgün elmi-nəzəri münasibəti ilə yanaşı, son dərəcə həssas milli vətənvərvərlik mövqeyi də dolğun ifadəsini tapmışdı. Bu dəyərli kitabdan bəhs edən məqaləm məhz sözügedən kitabın ruhuna "biçilmiş" bir mətbu orqanda, o vaxtlar baş redaktoru olduğum "Azərbaycan mübarizləri" qəzetində dərc olunmuşdu. Lakin nə o vaxt, nə də sonralar Təyyar Salamoğlunun sanballı monoqrafiyaları haqqında yazdığım "80-ci illər Azərbaycan romanı", "Roman onilliyinə aydın nəzəri baxış" adlı məqalələrimdə məsuliyyət yüküm indiki qədər ağır olmamışdı. Bu dəfə isə T.Salamoğlu haqqında yazmaq görkəmli mifoloq alimimiz Seyfəddin Rzasoyun təbirinci desək mənim də "rahatlığımı, sözün həqiqi mənasında, əlimdən aldı." Lakin bu elə bir daxili zərurət, mənəvi tələbat idi ki, yazmaq istəyindən heç cür "qaçış" yoxdu.

İsdedadlı alim T.Salamoğlu haqqında həyatın, cəmiyyət fəaliyyətinin müxtəlif istiqamətlərində danışmaq olar: Böyük hərflə yazılan şəxsiyyət, dəyərli filoloq həmkar, etibarlı dost, gözəl ailə başçısı, tələbələrin sevimlisi olan pedaqoq, nüfuzlu tənqidçi, dərin analitik təfəkkürə malik ədəbiyyatşünas, səriştəli elm təşkilatçısı və s. kimi. Lakin bu keyfiyyətlərin hamısını bir araya gətirmək, məqalə həcminə sığdırmaq imkansızdır. Buna görə də T.Salamoğlunun ədəbiyyatşünas-tənqidçi obrazının incəliklərinə varmağa, alimin son illərdəki tədqiqatlarının milli ədəbi-nəzəri elmimizdə əhəmiyyətli yeri, onun zənginliyinin təminində rolu barədə söz açmaqla yetinməyə qərar verdim.

Tanınmış alim T.Salamoğlu, ilk növbədə, Azərbaycan romanının inkişaf tarixinə dair fundamental tədqiqat əsərlərinin müəllifi kimi tanınır. Roman problemlərinin tədqiqinə qədər onun Azərbaycan uşaq ədəbiyyatı, mühacirət və repressiya ədəbiyyatı, Azərbaycan-Türkiyə, Türkiyə-Batı Trakya ədəbi əlaqələri, çağdaş milli ədəbiyyat və s. məsələlərə həsr etdiyi araşdırmaları ədəbi-elmi ictimaiyyətdə ciddi maraqla qarşılanıb. Lakin Azərbaycan romanından bəhs edən monoqrafiyaları T.Salamoğlunun elmi-nəzəri nailiyyətlərinin zirvəsində yer alır. Roman haqqında tədqiqatlarına toxunmadan, bu araşdırmaların ədəbiyyatşünaslıq elmimizə qazandırdığı yeniliklərdən söz açmadan onun elmi yaradıcılığı barədə dolğun təsəvvür yaratmaq imkansızdır. 80-ci illər romanı haqqında "Müasir Azərbaycan romanının poetikası" (2005), "Müasir Azərbaycan romanı: janr təkamülü /XX əsrin 80-ci illəri"/ (2007) monoqrafiyaları ona ədəbi-elmi ictimaiyyətdə roman mütəxəssisi kimi böyük nüfuz qazandırıb. Azərbaycan romanının poetika zənginliyini və janr təkamülünü "roman onilliyi"nin zəngin təsərrüfatı əsasında tədqiq edən araşdırmaçı dövrün romanının bitkin elmi panoramını yarada bilib.

Roman dünyanı və insanı daha dərindən duymağa, dərk etməyə imkan verən, üfüqlərinin sonu görünməyən yeganə ədəbi janr kimi tədqiqatçını dərindən düşündürür, onun spesifikasının incəliklərinə varmağa vadar edir, kifayət qədər açılmamış qatlarına, kəşf olunmamış dərinliklərinə enməyə səsləyir. T.Salamoğlunun janrın ədəbiyyatımızdakı nailiyyətlərini ümumiləşdirən tədqiqatları ilə tanışlıq onun həmin qatlara, dərinliklərə kifayət qədər nüfuz etdiyini təsdiqləyir, romanın konkret ədəbi mərhələlərdə inkişaf özəllikləri barədə ədəbiyyatşünaslıq qənaətləri formalaşdırır.

80-ci illər romanının mövzu, ideya, konflikt, süjet və kompozisiya bədii qəhrəman kontekstindəki təkamül prosesini diqqətlə izləyən tədqiqatçı janrın bu onillikdəki inkişafında sosial həyatın, ictimai-siyasi proseslərin təsiri aspektini diqqət mərkəzində saxlayır. O, haqlı olaraq dövrün roman təfəkkürünü dəyişən zamanın estetik düşüncədə həkk olunan izləri kimi dəyərləndirir. T.Salamoğlunun araşdırmaları təzə ədəbi meyarların yarandığı, stereotiplərin dağıldığı dönəmdə, "milli müstəqillik dövrünün ərəfəsi"ndə yeni roman strukturunun bədii xüsusiyyətlərini obyektiv dərk etməyə imkan verir.

Tədqiqatçı 80-ci illər çevrəsini daha da genişləndirərək Azərbaycan romanının müxətəlif ədəbi mərhələlərdə inkişaf xüsusiyyətlərini izləyir və hər mərhələnin özünəməxsus keyfiyyət yeniliklərini aşkara çıxarmağa müvəffəq olur. Mir Cəlal, Mehdi Hüseyn, Mirzə İbrahimov, İsa Hüseynov, İsmayıl Şıxlı, İlyas Əfəndiyev, Anar, Elçin, Sabir Əhmədli, Sabir Azəri, Fərman Kərimzadə, Çingiz Hüseynov, Kamal Abdulla, Seyran Səxavət, Sabir Rüstəmxanlı, Ağarəhim Rəhimov, Mahirə Abdulla kimi müxtəlif ədəbi nəsilləri təmsil edən yazıçıların bədii nəsrinə, əsərlərinin ideya-mövzu xüsusiyyətlərinə, yaradıcılıq üslubuna, romanlarınım poetikasına dair tədqiqatları XX əsrin müxtəlif onilliklərində və XXI əsrin əvvəlində janrın özəllikləri haqqında bitkin təsəvvür yaradır.

Vahid fikir mərkəzinin müəllif mövqeyi olduğu monoloji roman da, mahiyyətində dialoji dünyagörüşün dayandığı polifonik roman da T.Salamoğlunun nəzəriyyəsində nəsrin çoxşaxəli yaradıcılıq axtarışlarının məntiqi nəticəsi kimi səciyyələndirilir. Tədqiqatçı Mixail Baxtin nəzəriyyəsini Azərbaycan romanına tətbiq edir, polifonizmin milli nəsrimizdə bir sistem halında ilk dəfə İsa Hüseynovun "İdeal" romanında təzahür etdiyini aşkara çıxarır. T.Salamoğlunun təhlilinin məntiqi bizi belə bir həqiqətə inandırır ki, İsa Hüseynovun öz monoloji romanı "Yanar ürək"dən imtina etməsi, onu "bəsit" görməsi "İdeal"ın məhz polifonik üstünlüyü hesabına baş verib.

Tədqiqatçı "konflikti varlıq fəlsəfəsinə insanların fərqli baxış bucaqlarından yaranan" monoloji romanı (Anar, "Beşmərtəbəli evin altıncı mərtəbəsi") və zaman haqqında həqiqətin "əzablı doğuluşundan ibarət" olan postmodernist romanı (Kamal Abdulla, "Yarımçıq əlyazma") ideya, obraz, janr, üslub xüsusiyyətlərinə görə fərqli rakurslardan qiymətləndirir. Lakin müasir romanın hər iki istiqaməti ilə bağlı təhlillərdə bədii mətnin cövhərində çağdaş dünyanın, çağdaş varlığın problemlərinə həssas sənətkar münasibətinin dayandığı önə çəkilir, bunun bədii həqiqət modelinin dərkində aparıcı amil rolu vurğulanır.

Tarixi və çağdaş ədəbi prosesdə roman, tarixi romanın tipologiyası, problematikası, əsas ideya istiqamətləri, bədii qəhrəman konsepsiyası, janrın struktur xüsusiyyətləri, yeni forma və bədii inikas üsulları, üslubi təmayülləri T.Salamoğlu tədqiqatlarında nəzəri çözümünü tapan başlıca yaradıcılıq məsələləridir. Sinkretik üslub, postmodernizm, polifonik roman haqqında qənaətləri tədqiqatçının roman məsələlərinə son dərəcə həssas münasibətinin və ciddi elmi mövqeyinin göstəricisi kimi diqqəti çəkir, eyni zamanda 80-ci illər romanının sənətkarlıq axtarışlarına bütövlükdə çağdaş ədəbiyyatşünaslığın yeni baxış tərzini ehtiva edir. Bu cəhətdən ədəbiyyatşünaslığın həmişə aktual problemi olan roman T.Salamoğlu elmi-nəzəri irsinin də ən aktual problemi kimi görünür.

Görkəmli alim T.Salamoğlu, qeyd etdiyimiz kimi, ilk növbədə roman mütəxəssisidir. Lakin alimin yaradıcılıq sferasını təkcə romanla bağlı araşdırmalarla məhdudlaşdırmaq, yaxud



digər dəyərli tədqiqatlarını onun roman nəzəriyyəsinin "kölgəsində" təqdim etmək niyyətindən uzağıq. Alimin ədəbi-elmi marağının üfüqləri ən azı romanın üfüqləri qədər genişdir.

Tədqiqatçının tarixi və çağdaş ədəbi prosesə dair araşdırmaları ədəbi-nəzəri istiqaməti, mövzu və problematikasının rəngarəngliyi ilə seçilir. Bu tədqiqatlarda milli poeziyanın inkişaf yolları və ədəbi meylləri, ədəbiyyat tarixi, tənqid tarixi məsələlərinə, çağdaş ədəbi prosesin ən aktual problemlərinə obyektiv, aydın elmi münasibət bildirilir.

Professor T.Salamoğlu nəsr qədər poeziyanın təhlilində də yüksək elmi-nəzəri səviyyəyə cavab verən əsərlər müəllifidir. Poeziyaya nəsr kimi intensiv müraciət etməsə də, Azərbaycan şeirinin yaradıcılıq problemlərinə dərindən müdaxiləsi, onun özünəməxsusluqlarına, tanınmış nümayəndələrinin yaradıcılığına dair sərrast fikir və mülahizələri alimin bu sahədə də səriştəli söz sahibi olduğunu təsdiqləyir. Onun Mirzə Ələkbər Sabir haqqında tədqiqatları şairin yaradıcılığına yeni elmi metodoloji baxışla fərqlənir, Sabir ədəbi irsinə müasir ədəbiyyatşünaslığın dəyişən meyarlarının, prinsiplərinin ifadəsi kimi kifayət qədər dolğun görünür. Sabir realizmində milli intibah idealını tamamilə fərqli aspektdə - "ictimai yuxarılar"a münasibət kontekstində araşdıran T.Salamoğlu mütəfəkkir şairin "Azərbaycan xalqının millət kimi təşəkkülü və formalaşı"nda önəmli rolunu üzə çıxarır. Bununla da "milli intibah uğrunda mübarizədən doğulan" şairin sənət kredosunun dürüst mahiyyətini izah etmiş olur. Sovet dövrü ideologiyasının milləti xalq kimi təqdim etməyin, milli şair-yazıçıların, eləcə də Sabirin yaradıcılığında "xalq" anlayışını önə çəkməyin təsadüfi olmadığını əsaslandıran tədqiqatçı bu zərərli tendensiyanın əksinə, "Hophopnamə"nin "əzəl mübtədası" "millət" sözüdür" tezisi ilə çıxış edir. Sabir satirasının sosial məzmununda dövrün stixiyasından irəli gələn əsas məsələ kimi milli şüuru oyatmağa, millət olmağa çağırışı başlıca missiya kimi görən T.Salamoğlu şairin milli intibah idealı haqqında bütöv, bitkin təsəvvür yarada bilir.




Çağdaş ədəbi proseslə bağlı tədqiqatları içərisində alimin milli poeziyanın ən yeni nailiyyətlərinə münasibəti xüsusilə seçilir. T.Salamoğlunun ədəbi inkişafın qayğılarına köklənən, nəinki qərəzsiz, eyni zamanda təəssübkeş, xeyirxah tənqidçi mövqeyi yaşadığımız dövrün ədəbi prosesində fəal tənqidçi-şair münasibətlərinin örnəyi kimi qəbul edilə bilər. "Dağılmış yurdun şairi" kimi "qəmin poeziyası"nı yaradan Əli Rza Xələfli, ruhun təlqiniylə yazan, "bütün bəşəriyyətə - insanlığa tükənməz məhəbbəti ilə böyük", "hamını sevən" Mətləb Nağı, şeirlərindən "klassika qoxusu" gələn, "bütün varlığı ilə Tanrı işığına "bürünən" "Füzulinin qızı"" Təranə Turan Rəhimli poeziyaları haqqında tədqiqatlarında T.Salamoğlu həmin şairlərin yaradıcılığının çağdaş ədəbi prosesdə yerini müəyyənləşdirir, onların poetik imkanları barədə ədəbiyyatşünaslıq qənaəti formalaşdırır.

Poeziyadan yazan tənqidə münasibət aspektində isə görkəmli tənqidçi və ədəbiyyatşünas, çağdaş ədəbi prosesin kiçik bir uğuru da nəzərindən yayınmayan ədəbiyyat təəssübkeşi Vaqif Yusiflinin "Poeziyanın yolları və illəri (1960-2000-ci illər)" monoqrafiyasının tədqiqi diqqətəlayiqdir. Tarixi və müasir ədəbi prosesin bütün incəliklərinə bələd olan, çağdaş nəsrin, poeziyanın mükəmməl bilicisi Vaqif Yusiflinin yeni monoqrafiyası T.Salamoğlunun təhlillərində həm mövzu aktuallığı, müasirliyi və yüksək elmi-nəzəri səviyyəsi ilə, həm də ənənəvi ədəbiyyatşünaslıq problemlərinə təzə yanaşma tərzi ilə seçilən tədqiqat əsəri kimi dəyərləndirilir.

Professor T.Salamoğlunun tənqid tarixinə dair araşdırmaları onun nəzəri irsində xüsusi diqqət, təhlil və dəyərləndirmə tələb edən yaradıcılıq istiqamətidir. Professional ədəbi tənqidin yarandığı XIX əsrdən günümüzədək mürəkkəb və zəngin inkişaf tarixi olan milli ədəbi tənqidimiz T.Salamoğlu tədqiqatlarında "təzə-tər" ədəbiyyatşünaslıq meyarları ilə araşdırılır, sovet dövrü ideologiyasının elmdə sabitləşdirdiyi qənaətləri "alt-üst edən" ədəbi-nəzəri hökm və mülahizələrlə yadda qalır.

Məlum olduğu kimi, uzun illərdir akademik K.Talıbzadənin çox dəyərli tədqiqat əsəri - "Azərbaycan ədəbi tənqidinin tarixi" (1984) monoqrafiyası ali məktəblərin filologiya fakültərələrində analoqu olmayan yeganə dərslik kimi istifadə olunur. Həmin əsərin nəşrindən otuz ildən artıq vaxt ötüb. Və nəzərə alsaq ki, əsər "yerində böyük bir elmi-metodoloji boşluq qalan" (N.Cəfərov) sovet ədəbiyyatşünaslığının ən dəyərli örnəklərindən biridir, indi tənqid tarixinə dair yeni tədqiqatların yazılması zərurəti daha təxirəsalınmaz bir vəzifə kimi görünür. K.Talıbzadə elmi yaradıcılığında sovet dövrünün ideoloji səhvlərindən nə qədər məharətlə yayınmağı bacaran azsaylı alimlərimizdən olsa da, ideologiyanın diktə etdiyi ədəbiyyatşünaslıq prinsiplərindən irəli gələn elmi-metodoloji yanlışlıqların "Azərbaycan ədəbi tənqidinin tarixi" monoqrafiyasında da nəzərə çarpması təbii qəbul edilməlidir.

Milli müstəqillik dönəmindən başlayaraq elmin bütün sahələrinə təzə metodoloji baxış, bədii materiala yeni nəzəri prinsip və tələblərlə yanaşmaq ehtiyacı bir çox dəyərli tədqiqat əsərlərinin ərsəyə gəlməsini şərtləndirdi. Milli ədəbi tənqid tariximizə dair gözlənilən sistemli tədqiqat əsəri hələ yazılmasa da, bu sahədə görülən işlər gələcəkdə tənqidimizin bütün inkişaf mərəhələlərinin geniş, fundamental tədqiqinə zəmin hazırlayır. Bu zəmin rolunda T.Salamoğlunun "Ədəbi tənqid tarixinə dair portret-oçerklər"i (2011) son illərin ədəbi tənqid tarixinə dair ən qiymətli tədqiqatlarından biri, eyni zamanda filoloq-tələbələrin masaüstü kitabı kimi yaxın gələcəkdə Azərbaycan ədəbi tənqidinin tarixinin yazılması missiyasının da bu tədqiqatçı tərəfindən yerinə yetiriləcəyi proqnozunu verir.

Professor T.Salamoğlu Azərbaycan ədəbi tənqidinin görkəmli nümayəndələri Mirzə Fətəli Axundzadə, Firudin bəy Köçərli, Əlibəy Hüseynzadə, Hənəfi Zeynallı, Bəkir Çobanzadə, Əli Nazim, Mehdi Hüseyn, Cəfər Xəndan, Əhəd Hüseynov, Bəkir Nəbiyev, Nizami Cəfərov haqqında portret-oçerklərdə təmsil etdikləri ədəbi tarixi mərhələlərin spesifikasına nəzər salır, ədəbi prosesdə onların tənqidi yaradıcılığının yerini müəyyənləşdirir. Həmin tənqidçilərin xidmətləri tənqidin tarixi inkişaf yolu, ədəbi prosesdə missiyası, ədəbi meyl və cərəyanların, məktəblərin formalaşmasına, inkişafına təsiri aspektində araşdırılır.

Tənqid tariximizin 1920-ci illərdən sonrakı inkişaf mərhələlərini sistemli şəkildə əhatə edən konkret bir elmi-nəzəri mənbə yoxdur. K.Talıbzadənin "Azərbaycan ədəbi tənqidinin tarixi" əsəri də tənqidi fikrin 1920-ci illərə qədərki inkişaf dövrünü əhatə edir. Tədqiqatçılar, eləcə də filoloq tələbələr 20-ci illərdən sonrakı ədəbi tənqid haqqında məlumatı müxtəlif monoqrafiyalar, məqalələr toplusu, ədəbi jurnallar və s. mənbələrdən əldə edirdilər. Bu baxımdan, T.Salamoğlunun sözügedən kitabı ciddi elmi nəzəri və praktiki əhəmiyyət kəsb edir. Kitabda professional tənqidin başlanğıcı - Mirzə Fətəli Axundzadə mərhələsindən tənqidin ən yeni dövrə qədərki inkişaf yolunda mühüm xidmətləri olan görkəmli tənqidçilər haqqında portret-oçerklər yer alır. "Ədəbi tənqid tarixinə dair portret-oçerklər" bir tərəfdən M.F.Axundzadə, F.Köçərli, H.Cavid, A.Səhhət, Ə.Hüseynzadə kimi tənqid tarixinə dair tədqiqatlarda, dərsliklərdə dönə-dönə təhlil obyektinə çevrilən görkəmli ədəbi simaların tənqidi görüşlərinə yeni elmi-metodoloji, konseptual baxış tərzi ilə seçilirsə, digər tərəfdən ədəbiyyatşünaslıq materiallarında, tənqid tarixlərində haqqında səthi bəhs olunan, dərsliklərdə yer almayan tənqidçilərin - H.Zeynallı, B.Çobanzadə, M.Hüseyn, Ə.Nazim, C.Xəndan, Ə.Hüseynov, B.Nəbiyev, N.Cəfərov nəzri-estetik irsinin araşdırılması ilə dəyər qazanır.

Türkiyəli ədəbiyyatşünas, İzmir Dokuz Eylül Universitetinin müəllimi, Kıbrıs, Balkanlar, Avrasiya Türk Ədəbiyyatları Beynəlxalq Qurumunun başqanı Fəyyaz Sağlam T.Salamoğlunun bu tədqiqat əsəri haqqında yüksək təəssüratlarını müəllifə müraciətlə yazır: "Ədəbi tənqid tarixinə dair portret-oçerklər" adlı kitabı bu gün oxuyub bitirdim. Mənim Azərbaycandan oxuduğum ən maraqlı kitablardan biri kimi yadımda qaldı. İstifadə etdim, elmi biliklərimi sınadım və inkişaf etdim. Belə bir qiymətli kitabın müəllifi kimi sizi ürəkdən təbrik edirəm. Türk dünyası ədəbiyyatına tənqid problemlərinə dair mühüm bir əsər qazandırmısınız. Azərbaycan ədəbiyyatı ilə bağlı bu uğurlu xidməti Türk dünyası ədəbiyyatının ortaq dəyərləri və şəxsiyyətləri baxımından da eyni bir metodla davam etdirəcəyinizə inanıram."

O, milli ədəbiyyatşünaslığımıza nəsrin, poeziyanın, tənqidin, tənqid tarixinin, ədəbiyyatşünaslıq tarixinin tədqiqinə dair onlarla qiymətli tədqiqat əsərləri qazandırıb. Həmin əsərlərdə Azərbaycan ədəbiyyatının tarixi və müasir problemləri yüksək məsuliyyət hissilə araşdırılıb, ləyaqətlə çağdaş elmi-nəzəri fikir müstəvisinə çıxarılıb. Məhz buna görə T.Salamoğlunun hər yeni kitabı təzə bir tədqiqat, məqalə mövzusuna çevrilib. Onun kitabları haqqında ədəbiyyatşünaslıq və tənqidimizin ən görkəmli nümayəndələrinin, nüfuzlu söz sahiblərinin məqalələrinə diqqət yetirdikdə də bunun şahidi oluruq. Akademik Bəkir Nəbiyev, professor Himalay Qasımov, professor Abbas Hacıyev, filologiya üzrə elmlər doktoru Seyfəddin Rzasoy, dosent Nəcəf Nəcəfov, dosent Təranə Rəhimli və başqalarının T.Salamoğlunun nəzəri təfəkkürünə, analitik imkanlarının dərinliyinə, ədəbiyyatşünas-tənqidçi məntiqinə yüksək dəyər verən məqalələri bu qəbildəndir. Görkəmli filoloq, ədəbi prosesin "nəbzini tutmağı" bacaran professor N.Cəfərov ədəbi tədbirlərdən birində "Təyyar Salamoğlu romandan yazır, özü də çox ağıllı yazır" ifadəsini işlətmişdi. Təkcə romandan deyil, ədəbi-nəzəri elmin əsərlərində müraciət etdiyi bütün sahələrindən "ağıllı yazan" alimin zəngin elmi yaradıcılığı onun haqqında yeni tədqiqatlar yazmağa stimul verir.

Mərhum akademik Bəkir Nəbiyev T.Salamoğlunun "Ən yeni Azərbaycan ədəbiyyatı" (2008) kitabına yazdığı ön sözdə onun ədəbiyyatşünas və tənqidçi kimi "daha geniş üfüqlər fəth edəcəyinə" inamını ifadə edirdi. Biz Söz ləyaqətini uca tutan, həmişə ədəbi məsuliyyət hissilə yazıb-yaradan məhsuldar alimin - T.Salamoğlunun bu gün həmin üfüqləri, elm zirvəsini fəth etdiyi zənnindəyik.

**Təranə Turan Rəhimli,**
**filologiya üzrə fəlsəfə doktoru,**
**dosent**

# Xaqani Şirvaninin əsərlərində XI-XII əsrlərdə Şirvanın ictimai-iqtisadi münasibətləri



Dünya ədəbiyyatı tarixində elə böyük sənətkarlar vardır ki, onların yaratdıqları sənət əsərləri yalnız öz xalqının deyil, bütün dünya xalqlarının fikri inkişafına təsir göstərmişdir.Dahi Azərbaycan şairi Əfzələddin Xaqani də dünya ədəbiyyatının ölməz və qüdrətli simalarındandır. Qeyd edək ki, Xaqani Şirvaninin əsərlərində XI-XII əsrlərdə Şirvan dövlətində mövcud olan ictimai-iqtisadi münasibətlər tam dolğunluğu ilə öz əksini tapmışdır. Şair zəmanəsindəki ictimai hadisələrə qarşı son dərəcə həssas olmuşdur. Xaqani Şirvani bir tərəfdən saray şeirinin gözəl nümunələrini yaratmış,digər tərəfdən saraylara,hökmdarlara qarşı mübarizə, etiraz və üsyan mahiyyətli əsərlər yazmışdır.

Xaqani Şirvani böyük bir ədəbi irs qoyub getmişdir. Onun əsərləri dünya fikir tarixinin güzgüsüdür. Xaqani Şirvaninin ədəbi irsi 17 min beytlik lirik şeirlər "Divanı"ndan, "Töhfətül-İraqeyn" (İki İraqın töhfəsi),"Mədain xərabələri" adlı ictimai-fəlsəfi məzmunlu məşhur qəsidəsindən, şairin əxlaqi görüşlərinin ifadə olunduğu "Qəsideyi-Şiniyyə" (Şin hərfi ilə bitən qəsidə) qəsidəsindən,həbsdə olarkən yazdığı "Həbsiyyə" adlı şeirlər silsiləsindən, "Miratüs Səfa" (Saflıq aynası) kimi ölməz sənət nümunələrindən ibarətdir. Onun əsərlərində dövlət məmurlarının özbaşınalığı, dövlət mənafeyini şəxsi mənafeyinə qurban verənlər, riyakarlar amansız tənqid atəşinə tutulurdu. Şirvanşah III Mənuçöhrün baş vəziri ilə ələqədar şairin qəzəbi hüdudsuzdur. O, yazırdı:

*Ey yəzidlər mülkünü viran edən,*
*Sən həmin yəzidsən,dəm vurma çox Əlidən.*
*Xaqani qeyzə gəlmiş dili var qılınc kimi,*
*Təslim ol, bu qəzəbin təkcə səbəbi sənsən!*

İctimai-siyasi hadisələrə qarşı son dərəcə həssas olan Xaqani Şirvani bu şeirində Şirvanşahların vəzirini 681-ci ildə imam Hüseynin qanını tökən Yezid İbn Müaviyəyə bənzədir.

Şairin əsl adı İbrahim, təxəllüsü Xaqani, nisbəsi Şirvani olmuşdur. İbrahim ilk təhsilini və tərbiyəsini Kafiəddin Ömər Osman oğlunun yanında almışdır. Sonralar Şirvanşahlar sarayının Məlikül-şüəarası sayılan Əbül Üla Gəncəvi İbrahimi Şirvanşahlar sarayına aparıb ona "Xaqani" təxəllüsünü vermişdir. Sonralar Xaqani ikiüzlülüklə dolu olan saray həyatından usanmış və saraya gəlməsindən peşman olmuşdur.Saray şair üçün getdikcə dözülməz zindana çevrilmişdi. Şair sarayda özünü qanadı qırılmış quş kimi dəmir qəfəsdə hiss edirdi. Xaqani Şirvani bütün bunlar haqqında 1156-cı ildə yazdığı, özünün həcmcə ən iri, məzmun baxımından ən dolğun əsəri sayılan və "Töhfətül-İraqeyn" poeması əndə ətraflı və geniş məlumat vermişdir. Şair saraydakı vəziyyəti 1120-1160-cı illərdə Şirvanda hökmranlıq etmiş Şirvanşah III Mənuçöhrün və 1160-cı ildə III Mənuçöhrün ölümündən sonra hakimiyyətə keçmiş Şirvanşah I Axsitanın hökmdarlıqları dövrlərindəki vəziyyəti şərh etmişdir. Xaqani Şirvani poemanın "Öz vəziyyətindən şikayət" bölməsində Şirvanı bir qəfəsə, özünü isə bu qəfəsdəki bir məhbusa bənzədir. Şair deyir ki, axı nə üçün Şamaxı kimi geniş və gözəl bir diyar onun gözündə zindana, məhbəsə oxşayır. Böyük sənətkar Şirvanşahların ölkədə yaratdığı acınacaqlı vəziyyətdən dəhşətə gəlir. O, deyir ki, Vətənim mənə bir zindan olmuş, hər tükü canıma zindanban , yəni həbsxana keşikçisi olmuşdur:

*Mən mənə yaradan tutiyəm, əfsus,*
*Şirvan qəfəsində olmuşam, məhbus.*
*Şamaxı bu gözəl ,bu geniş diyar,*
*Nə üçün gözümdə zindana oxşar?*
*Vətənim mənə ah, bir zindan olmuş,*
*Hər tüküm canımda zindanban olmuş.*

Xaqani Şirvaninin dövrü və şəxsiyyəti haqqında böyük Azərbaycan ədibi Mirzə Məhəmmədəli Tərbiyət Təbrizi də (1870-1940) özünün Azərbaycanın 844 nəfər görkəmli elm və sənət adamları haqqında məlumat verdiyi "Danişməndanı-Azərbaycan" əsərində də maraqlı məlumat vermişdir.

Xaqani Şirvani XII əsrdə Azərbaycanda feodalizmin inkişaf etdiyi dövrdə yaşayıb-yaratmışdır. Bu zaman Azərbaycanın cənubunda əsasən Eldənizlər, şimalında isə Şirvanşahlar hakimiyyətdə idi. Məhsuldar qüvvələr keçmişlə müqayisədə ölkədə daha da inkişaf etmişdi, kənd təsərrüfatı canlanmışdı. Şirvanşahlar dövləti böyüdükcə onun paytaxtı Şamaxı da böyüyür və inkişaf edirdi. Şirvanda getdikcə toxuculuq, ipəkçilik, dülgərlik, dəmirçilik, dulusçuluq, zərgərlik və s. peşələr getdikcə dah çox rəvac tapır, ticarət genişlənirdi.

Onu da qeyd edək ki, ticarət artdıqca şəhərin əhalisi də artırdı. O zaman Şamaxıda 100 min nəfər əhali yaaşayırdı. Artıq Xaqani Şirvaninin vətəni Şamaxı Yaxın Şərqin həm siyasi, həm də böyük ticarət və sənətkarlıq mərkəzlərindən birinə çevrilmişdi.Şirvanda iqtisadi həyatın belə yüksəlişi mədəni-maarif işlərinə, ədəbiyyatın, incəsənətin inkişafına da güclü təkan verir, bədii ədəbiyyatın inkişafı üçün əlverişli zəmin yaradırdı. Təsadüfi deyil ki, XII yüzillikdə Şirvanda şairlər məclisi fəaliyyət göstərmişdir ki, onun da ən fəal üzvlərindən biri Xaqani Şirvani olmuşdur. Onun şeirlərində əsas yeri insan , onun həyatı, sevinci, ağrı-acısı tuturdu. Xaqani Şirvani həmişə incidilmiş, lakin o heç kimi incitməmişdir. Şair yazırdı: "Uşaqlıqdan bu adətim olubdur ki, inciyim, ancaq incitməyim". Xaqani Şirvani ömrünün sonunadək haqqa, düzgünlüyə sadiq olmuşdur. O, şahlardan, xaqanlardan, acgöz, zülmkar hakimlərdən uzaqlaşmış, alimlərlə, elm adamları ilə dostluq etmişdir. Xaqani Şirvani zülmün, zalımlığın sonunun olmadığını bildirirdi. Xaqani Şirvani Şirvanşah Mənuçöhrün və Şirvanşah Axsitanın hakimiyyətləri dövründə 2 dəfə həbsxanaya düşmüş və həbsxanada olarkən "Həbsiyyə şeirləri" silsiləsini yaratmışdır. Həbsdə haqsızlıqla, zülmlə, şərlə daha yaxından üz-üzə dayanan, haqsızlığı, şəri, böhtanı öz üzərində müşahidə edən dahi sənətkar öz qələmi ilə düşmənləri ilə vuruşmuşdur. Şairin məğrur, əyilməz ruhu həbsxana həyatının dəhşətlərinə boyun əyməmiş, düşmənlərinə meydan oxumuşdur:

*Hər səhər qalxar göyə ah ilə əfqanım mənim,*
*Qərq olar qanda şəfəq tək çeşmi giryanım mənim!*
*Oxşayır günda ayağımda dəyirman daşına,*
*Qanlı göz yaşımla işlər bu dəyirmanım mənim!*

Xaqani Şirvani öz əsərlərində XI-XII əsrlərdə Şirvanın ictimai-iqtisadi həyatını yüksək sənətkarlıqla əks etdirmişdir. Şair onu həbsə salan Şirvanşah Axsitanın qarşısında belə baş əymirdi:

*O insanki dönüb dərdə , baş əyməz mərdə, namərdə,*
*Onu diz çökdürə bilməz tutan dörd əllə dünyanı.*

Saraylardan üz döndərən Xaqani Şirvani daim xalqa arxalanmış, özünü Xaqani deyil, Xəlqani adlandırmış, xalqını, Vətənini, doğma Şirvan torpağını hədsiz məhəbbətlə sevmişdir. Şair öz əsərlərində adi insanları, dərvişi sultandan, şahdan daha layiqli saymış, qəlbin saflığını, gözütoxluğu, düzlüyü daim tərənnüm etmişdir. "Azadlıqdan böyük nemət yoxdur"- deyən şair öz əsərlərində həmişə Vətəni, ananı vəsf etmişdir. Xaqani, həqiqətən, xalqına gözəl sənət əsərləri qoyub getmişdir. Məcburiyyət üzündən Şərq ölkələrini ziyarət adı ilə gəzib Bağdada gələn şairi xəlifə öz yanında saxlamaq istəyir. Vətənpərvər və məğrur şair Bağdad xəlifəsinə belə cavab verir: " Mən dəbir deyiləm, vəzir olmağa belə razı olmaram. Şirvanda anam məni gözləyir." Şirvanı cox sevən şair yazırdı:

*Şirvan ki var, hər cəhətdən ülviyyətin anasıdır,*
*Onun suyu, səhər yeli dərdlərimin dəvasıdır.*
*Mən Vətənə qurban olum, qurulmuşdu düzgünlüklə,*
*Bağdadı da dolandıran onun bollu qidasıdır.*

Uzaqgörən şair öz zəmanəsindən razı qalmasa da, gələcəkdə Vətənin azad olacağına, xalqın şən yaşayacağına , burada səadət quşunun qanad çalacağına inanaraq belə yazmışdı:

*Xaqani, gələr bir gün aləm səni xatırlar,*
*Lakin o şən aləmdə, ey dad, ola bilməzsən!*

Xaqani Şirvani öz əsərlərində Şirvanı, Şamaxını "doğma yurd", Təbrizi isə "ümidim, pənahım" adlandırmışdır. Təbrizi "ümidi, pənahı" hesab edən Xaqani Şirvani 1176-cı ildə Kəbə ziyarətindən sonra bir daha Şamaxıya qayıtmır, ömürlük Təbrizdə yaşayır. Böyük şair 1199-cu ildə Təbrizdə vəfat etmiş və bu şəhərin "Məqbərətüşşüərə" qəbirstanlığında dəfn olunmuşdur. Onun məzarı ilə yanaşı bu gün "Məqbərətüşşüərə" (Şairlər məqbərəsi) qəbirstanlığında ölməz şairimiz Məhəmmədhüseyn Şəhriyar da dəfn olunmuşdur.

Mən də böyük söz ustadımız Xaqani Şirvani kimi doğma Azərbaycanımızı sonsuz bir məhəbbətlə sevirəm.

**Leyla Əliyeva,**
**Tarix fakültəsinin II kursunun 202-ci qrup tələbəsi**

# Mübariz

***Azərbaycanın Milli Qəhrəmanı Mübariz İbrahimovun əziz xatirəsinə***



Çoxdur bu torpağın igid,qəhrəman,
Qorxmaz, cəsarətli,mərd oğulları.
Düşmən üzərinə əmr edilən an,
Qovub çıxararıq biz yağıları.

Vətənin qeyrətli igidlərindən,
Biri, birincisi Mübariz olmuş.
Mübariz deyəndə titrəyir düşmən,
Düşmən ürəyində xəncər,biz olmuş.

Bir gecədə keçib düşmən tərəfə,
Məhv etdi onların əsgər,zabitin.
Sənə alqış deyir indi min dəfə,
Səni unutmayan xalqın,millətin.

O gün qazanaraq şəhid adını,
Yazdırdın adını əbədiyyətə.
Həmin gün doğruldub əsgər andını,
Bir nümunə oldun bu cəmiyyətə.

**Şəhriyar Nur,**
**Filologiya fakültəsinin III kursunun**
**301-ci qrup tələbəsi**

# "Sağlam bədəndə sağlam ruh" layihəsi çərçivəsində idman yarışı keçirilib



Mart ayının 18-də Azərbaycan Dövlət Pedaqoji Universitetinin (ADPU) Tələbə Gənclər Təşkilatının (TGT) təşkilatçılığı və Səbail Rayon Gənclər və İdman İdarəsinin təşkilati dəstəyi ilə reallaşan "Sağlam bədəndə sağlam ruh" adlı layihə çərçivəsində idman yarışının final oyunları keçirilib.

Finalda üç komanda 1-ci, 2-ci və 3-cü yerin uğrunda mübarizə aparıblar. 1-ci yer: Fighters (Tarix fakültəsi) 398/420; 2-ci yer: Gladiators (Riyaziyyat və informatika fakültəsi) 394/420, 3-cü yer: Boz qurd (Coğrafiya və çağırışaqədər hazırlıq fakültəsi) 267/420

Yarışın hakimləri beynəlxalq dərəcəli hakim, Bədən tərbiyəsi və idman kafedrasının baş müəllimi Tofiq Cəbrayılov və həmin kafedranın baş müəllimləri Rafiq Qəribovla Musa Musayev olublar.

Yarışda qalib gələn komandalar təltif olunublar.

**Ramid Seyfullayev,**
**Pedaqogika və psixologiya fakültəsinin II kurs tələbəsi, TGT-nin fakültə sədri**

# "Ulduz" jurnalının baş redaktoru Qulu Ağsəs ilə görüş keçirilib

(Əvvəli 6-cı səhifədə)

bəsi Xəyalə Dadaşova daha fəal iştirak edərək müasir ədəbi proseslə, eləcə də "Ulduz" jurnalının Azərbaycan ədəbi mühitindəki yeri və rolu barədə öz fikir və mülahizələrini bölüşüblər. Eyni zamanda Qulu Ağsəs 301-ci qrup tələbəsi Bahar Ağayeva, 302-ci qrup tələbəsi Təbriz Ağaverdiyev, 304-cü qrup tələbəsi Həqiqət Həsənova, 306-cı qrup tələbəsi Səbinə Rəcəbova, 102-ci qrup tələbəsi Aysel Məmmədova və digər tələbə-gənclərin "Ulduz" jurnalının fəaliyyəti ilə bağlı və bütövlükdə bədii ədəbiyyatla bağlı suallarını cavablandırıb. Onun həmçinin ADPU-nun Filologiya fakültəsinin yaxşı oxuyan və bədii ədəbiyyata xüsusi marağı olan 10 nəfər tələbəsinin "Ulduz" jurnalını pulsuz olaraq əldə edə biləcəklərini bildirməsi görüş iştirakçıları tərəfindən razılıq hissi ilə qarşılanıb.

Görüşdə Ədəbiyyat və onun tədrisi metodikası kafedrasının müdiri, professor Zahid Xəlil, Azərbaycan ədəbiyyatı tarixi kafedrasının müdiri, professor Himalay Qasımov və Xarici dillər kafedrasının müdiri, dosent Gülçöhrə Alıyeva iştirak ediblər.

Görüşə yekun vuran Filologiya fakültəsinin dekanı, professor B.Xəlilov yazıçı və şairlər ilə belə görüşlərin keçirilməsinin gənclər üçün çox vacib olduğunu qeyd edib və bu məzmunlu görüşlərin gələcəkdə də davam etdiriləcəyini bildirib.

**Könül NƏZƏROVA**

# Allah rəhmət eləsin!

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Ümumi tarix kafedrasının professoru Musa Həsənova qızı
**Gülsüm Həsənovanın**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi "Türk araşdırmaları" elmi-tədqiqat laboratoriyasının əməkdaşı Aynurə Babayeva atası
**İsa Hüseynovun**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.

Azərbaycan Dövlət Pedaqoji Universitetinin kollektivi Elmi kitabxananın böyük kitabxanaçısı Gülər Ağarzayevaya qayınanası
**Zinyətxanım Ağarzayevanın**
vəfatından kədərləndiyini bildirir və dərin hüznlə başsağlığı verir.


Redaktor əvəzi: Mənsur İBRAHİMOV

ÜNVANIMIZ: Bakı, Ü. Hacıbəyov küçəsi, 68 ADPU, Tel.: 498-18-41

Məqalələrdəki faktlara görə redaksiya məsuliyyət daşımır

ADPU-nun web-portalı: adpu.edu.az
Fotolar Əli Səmədovundur
Şəhadətnamə № 191

Sifariş: 1078
Sayı: 1500
Çapa imzalanıb: 31.03.2015-ci il

ADPU-nun mətbuat və informasiya şöbəsinin kompüter mərkəzində yığılıb, "Azərbaycan" nəşriyyatında səhifələnib və "Azərbaycan" nəşriyyatının mətbəəsində ofset üsulu ilə çap edilmişdir.